AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ ADINA ƏLYAZMALAR İNSTİTUTU

**MİRZƏ AĞADADAŞ MÜNİRİ**

# BAHAR AĞLAYIŞI

**Kitab Mirzə Ağadadaş Münirinin
150 illik yubileyinə ithaf olunur**

**BAKI-2016**

***AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitunun elmi şurasının 12 saylı (29 dekabr 2014) iclasının qərarı ilə çap olunur.***

Toplayanı:
**Əliabbas Müznib, Sona Xəyal**

Transfoliterasiya edib nəşrə hazırlayan
və ön söz müəllifi:
**SONA XƏYAL**

Redaktorlar:
**MİRCƏLAL ZƏKİ**
**RAUF ŞEYXZAMANLI**

Rəyçilər:
**ƏZİZAĞA NƏCƏFZADƏ**
filologiya üzrə fəlsəfə doktoru
**QUTİYERA CƏFƏROVA**

Mirzə Ağadadaş Müniri. Bahar ağlayışı.
Bakı, "Ekoprint", 2016. 80 səh.

Kitabda XIX-XX əsrdə Bakı-Abşeron ədəbi mühitində yazıb-yaradan görkəmli Azərbaycan şairi Mirzə Ağadadaş Münirinin müxtəlif janrda və müxtəlif mövzuda yazdığı şeirləri toplanmışdır.

# "BAHAR AĞLAYIŞI"

XIX-XX əsrlərdə Bakı və Abşeron ədəbi mühiti bir sıra istedadlı şairlər yetişdirmişdir ki, onlar dəyərli, dillər əzbəri olan klassik şe'r nümunələri yaratmışlar. Bu dövrdə "Məcməüş-şüəra" ədəbi məclisinin fəaliyyəti xüsusilə maraq doğurur. Məclis üzvlərindən Məhəmmədağa Cürmi, Mirzə Əbdülxalıq Yusif, Mirzə Əbdülxalıq Cənnəti, Mikayıl Seydi, Haşım bəy Saqib, Muxtar Bisavad, Seyid Zərgər, Əbdülhəmid Mina, Mirzə Ağadadaş Müniri, Ağadadaş Sürəyya, Kərim ağa Salik, Mirzə Məhəmməd Müsəvvir, Əbülhəsən Vaqif, Azər Buzovnalı və başqaları öz yaradıcılıq nümunələri ilə dövrün tanınan, sevilən, dəyərli insanları olmuşlar. Sovet dönəmində uzun illər bu şairlərin yaradıcılığı tədqiqatdan uzaq qalmış, o qədər də xalqa tanıtdırılmamışdır.

Zaman keçdikcə, Azərbaycan ziyalıları əlyazmaların toplanılması məsələsini gündəmə gətirmiş, Əlyazmalar fondu təşkil edilmiş, sonralar fond elmi tədqiqat institutuna çevrilmiş və ciddi tədqiqat işlərinə başlanılmış, bir sıra kitablar nəşr edilmişdir. O cümlədən, Bakı-Abşeron ədəbi mühitində yaranan ədəbi irs nümunələri də mətbuatda çap olunmuş və mərhum tədqiqatçı alim, filologiya elmləri namizədi Cəfər Rəmzinin nəşrə hazırladığı "Deyilən söz yadigardır" adlı şeir toplularında, eləcə də filologiya elmləri namizədi Nəsrəddin Qarayevin "Poetik məclislər", filologiya elmləri namizədi Məmməd Nuru oğlunun "Azərbaycan qəzəlləri" adlı şeir toplularında verilmiş qısa tərcümeyi-hallar və şeirlər oxuculara istedadlı şairlərin varlığını

bildirmişdir.

Dövr dəyişildikdən sonra isə məqsədyönlü tədqiqatlar aparılmış, Bakı-Abşeron şairlərinin kitablarının nəşrə hazırlanması Dövlət planına daxil edilmiş, əlyazmalar üzə çıxarılmış, Mirzə Həsib Qüdsinin, Yusifin, Cənnətinin, Pərişanın, Müznibin, Əmin Abidin, Səməd Mənsurun, Azərin əsərləri ayrı-ayrı kitablar şəklində nəşr edilmişdir. Mirzə Ağadadaş Münirinin şeirlər kitabı da bu sıradandır.

Ağadadaş Cəfərov (Müniri) 1863-cü ildə Bakının Hövsan kəndində anadan olmuş, yeddi yaşında atasını itirmiş və anasının himayəsində böyümüşdür. Şairin tərcümeyi-halını əks etdirən olduqca maraqlı bir şeiri vardır ki, oradan şair haqqında dəqiq məlumatlar alırıq. Məlum olur ki, atası öz zəhməti ilə dolanmış, Xəzər dənizində üç onluq maaşla çalışmış, təəssüf ki, elə dənizə qərq olub dünyasını dəyişmişdir. Məhəllə dərzisi olan anası yeddi yaşında yetim qalan Ağadadaşı oxutdurmuşdur. Şair "Özüm oldum cocuqlara rəssam" deyə peşəsini bildirir və eyni zamanda xəyal quşunun göylərdə pərvaz etdiyini, qələmlə həmdəm olduğunu, şe'rlər nəşr etdirdiyini qeyd edir.

Münirinin şeirlərini ilk dəfə "Deyilən söz yadigardır" toplularında oxumuşuq. Kitabın I hissəsində şairin "əlində", "olmayan yerdə", "özgədir", "xali", "sevər" rədifli və "Gəh salıb rüsxarə zülfün, gəh açıb zülfün tamam", "Elm etdi rövşən, ey dil, Avropani", "Könül quşin edüb ol şuxi-canşikar şikar" misraları ilə başlayan rədifsiz qəzəlləri, II hissəsində isə "Tərcümeyi-hali-Ağadadaş Müniri Cəfər oğlu" adlı bir əsəri, "Poetik məclislər" kitabında "Eşqində, ey sənəm, nə qədər varam, ağlaram" və "Gəh salıb rüxsarə zülfün, gəh açıb ruyin təmam" misraları ilə başlayan qəzəlləri, "Azərbaycan qəzəlləri" toplusunda "Könül quşun edib ol şuxi-canşikar şikar" mətləli və "olmayan yerdə",

"əlində" rədifli qəzəllər verilmişdir. Hacı Soltanın "Gizli xəzinələrdən incilər" toplusunda isə şairin "Ənar qəsidəsi" verilmişdir.

AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda B-1791 şifrəli qovluqda 22,5x14,5, 21x8, 21x13, 35x11 sm ölçülü vərəqlərdə Ağadadaş Münirinin şeirləri vardır ki, bunlar göy, yaşıl, qara, bənövşəyi mürəkkəblə, bəziləri karandaşla yazılmışdır. Arxası şəkilli vərəqlərdəki yazılar Ə.Müznibindir. Digər yazıların Münirinin avtoqrafı olması ehtimalı var. Müznibin xətti ilə olan şeirlərin altında şairin adı, təxəllüsü qeyd olunmuş, bəzilərinin altında tarix qoyulmuşdur. Cəfər Rəmzinin toplularındakı şeirlər də burada vardır. 51 vərəq həcmində olan bu əlyazma badımcanı rəngli cildə tutulmuşdur. Burada şairin qəzəlləri, şair dostları Əbdülhəmid Minaya məktubu, Mirzə Əbdülxalıq Yusifə 1343 tarixli mərsiyəsi, Seyid Zərgərə, Mikayıl Seydiyə, Mirzə Səməndər Dərbəndiyə yazılmış şeirləri vardır. Əlyazmadan görünür ki, XX əsrin əvvəllərində şairin şeirləri "Dirilik" jurnalında, "Ədəbi parçalar" və "Türkcə qəzəllər" adlı toplularda çap olunmuşdur.

Əlyazmalar İnstitutunda əlyazması saxlanılan Nəcəfqulu bəy Şeydanın "Gülşəni-maarif" təzkirəsində 24 şairin ədəbi irsindən nümunələr və onlar haqqında qısa məlumat yer alır ki, onlardan biri də Müniridir. (Təzkirəni filologiya elmləri doktoru Paşa Kərimov nəşrə hazırlamışdır). Təzkirə müəllifi yazır: "Müniri". İsmi isə Mirzə Ağadadaşdır. Atasının adı Cəfərdir. Məzkur əslən Bakının şərqi-cənub tərəfində vaqe Hövsan qəryəsindən olubdur. Gəmidə muzdurluq edib, ildə otuz manat məvacib aldığına baxmayaraq, oğlu Ağadadaşı elmə həvəsi olduğundan məktəbə dərs oxumağa qoyur. Orada bir neçə il oxuduqda özü-

nün istedadlı olduğundan Kəlamullahı qiraət etməkdən savayı fars dilini dəxi kamil öyrənir. Bu vaxtlarda özündə şeirguluq təb'i olduğunu bilib şeir deməyə başlar. Get-gedə şeirguluqda tərəqqi edərək Bakıdakı müasir şüəaranın cümləsindən hesab oluna bilər. Onun əfkar və xəyalatından ləm'əpaş olan nəzmlər Zeyldə dərc olunur". Təzkirədə şairin 28 əsəri verilmişdir ki, burada qəzəllər, rübailər, Xəyyamdan iki rübainin tərcüməsi, bir qitə və qəzəl adı altında bir məsnəvi vardır.

Kitabı tərtib edərkən ilkin sırada şairin qəzəllərini yerləşdirdik. Müxtəlif şeirlər bölümündə şairin nəzmə çəkdiyi tərcümeyi-halını, "Ənar qəsidəsi"ni və s. şeirləri, sonra "Qəmli sətirlər"i və "Mənzum məktublar"ı verdik. Ümumiyyətlə, işlədiyimiz əlyazma kitabındakı şeirlərdən başqa, Münirinin əldə etdiyimiz bütün əsərlərini də kitaba daxil etdik. Şairin fars dilində yazdığı klassik şeir nümunələri də vardır, lakin müəyyən səbəbdən onları kitaba daxil edə bilmədik.

Ağadadaş Münirinin yaradıcılığında qəzəllər, xüsusən də klassik şeir ənənəsini yaşadan lirik-aşiqanə, ürfani qəzəllər üstünlük təşkil edir. "Gəh salıb rüxsarə zülfün, gəh açıb ruyin təmam" misrasıyla başlayan ilk qəzəldə lirik qəhrəman öz mə'şuqunu vəsf edir, xalını görən ürək quşunun pərvaza gəldiyini, zülfü açılıb tökülərkən hamının heyrətdə qaldığını bildirir.

Şairin "kimi" rədifli qəzəlində lirik qəhrəmanın öz könlünə müraciəti, bir növ nəsihəti var. Əslində bu bütün aşiqlərə olan nəsihətdir. Burada şair hər nəsihət üçün uyğun təşbehlər seçmiş, bənzədilən obyektə uyğun mənzərə yaratmışdır.

Münirinin digər qəzəllərində də poetik obrazlara bələnmiş dəyərli fikirləri vardır: "Lalə tək bağrına bir dağ

qoyub xalü xətin", "Dəhanın varü yox bəhsində varü yoxdan əl çəkdim", "Əgər şəkkər təmənnasındasan, Xosrovluq izhar et Və gər şirin görərsən tişə zəxmin, onda Fərhad ol", "Səni Həq tək yaradıb, ey büti-ziba, özü tək", "Zülf ilə xalü xətin zikrin bilirmi zahid", "Bir ahu gözlüyə seydəm ki, hər səyyadə ram olmaz", "Rəqs ilə mövləvilər zikri-ləbin tutarlar, Canan gələndə bəzmə məstanə, tar əlində" və s.

Ağadadaş Münirinin irfani qəzəlləri mövzu və məzmun etibarilə daha çox diqqəti cəlb edir. Bu qəzəllərdə hakimi-mütləqin vəsfi obrazlı ifadələrlə oxucuya çatdırılır. "Kimdə xəlq olmuş o idrak, o fəhmü əqlü huş", "Adəmi xəlq eylədin ayineyi-vəhdətnüma", "Sənsən ol gövhər ki, bir sərraf görmübdür səni" və s. misralarda Allah-təalanın bənzərsiz sifətləri obrazlaşdırılmışdır.

Şairin mənəvi dəyərləri, insani sifətləri əks etdirən qəzəlləri də maraqlıdır. "Yerdə" rədifli qəzəlində təbiəti, insanı, məktəbi, maarifi, ədaləti, əmanəti, məhəbbəti, mehr və ülfəti obrazlı şəkildə misralayan şairin mənəviyyata verdiyi yüksək dəyərin şahidi oluruq.

Münirinin ən maraqlı şeirlərindən biri də "türk" rədifli qəzəldir. Qəzəl türkün cahana gəlişini, keçdiyi sınaqları, onun xarakterik cəhətlərini əks etdirir. Daha sonra türkün səhrada hər karvana yol göstərdiyini, tiri-şəhabı qılınclara nazir etdiyini, vuruşlarda heç bir səhvə yol vermədiyini, dərya kimi həmişə təlatümdə olduğunu qeyd edir və sonda ondan daha böyük işlər gözlədiyini bildirir.

Şairin "Bahar ağlayışı" adlı müxəmməsi mart soyqırımına həsr edilmişdir. Burada fərvərdin ayının gəldiyini, yəni baharın girdiyini, səhraların laləzar olduğunu, dağ ətəklərinin lalələrlə dolduğunu, çiçəklərin əldən ixtiyar aldığını, bülbüllərin biqərar olduğunu bildirən poetik obraz-

larla çəkilmiş bir təbiət mənzərəsi yaradan şair bəndin sonunda "Gəlməyəydi kaş fərvərdin..." deyə təəssüf edir. Bu təəssüfün səbəbini oxucu sonrakı bəndlərdən anlayır: güllər bir-birinə bir qara xəbəri çatdırırlar, butalar atəşin dillə nalə edir, qönçələr açılmır, qüssədən libaslarını didirlər. Bu qara xəbər mart soyqırımıdır. Şair yazır ki, çaylar, dənizlər bulanıq axdı, cahana Nuh əsri tək tufan düşdü, şəhərlər qarət olundu. Əsrlərdi insanlar belə dəhşətli, qanlı mənzərə görməmişdilər. Qafqaziya bağında salamat bir ağac qalmadı. Evlər viran oldu, ürəklər qüssələndi, uşaqlar ağlar oldu, müsəlmanlara atəş açdılar, bacardıqları vəhşilikləri etdilər.

Ümumiyyətlə, XIX-XX əsr Bakı-Abşeron ədəbi mühitində yaşayıb-yaradan şairlərin, o cümlədən Münirinin ədəbi irsinin araşdırılıb üzə çıxarılması, nəşr edilib bütövlükdə xalqa çatdırılması və tədqiq olunması vacib məsələlərdəndir.

***2013***

***SONA XƏYAL***

*AMEA-nın Məhəmməd Füzuli adına*
*Əlyazmalar İnstitutunun böyük elmi işçisi,*
*Azərbaycan Yazıçılar Birliyinin*
*"İRS" komissiyasının sədri*

# QƏZƏLLƏR

* * *

Ey əyanü bəs nihanü vey nihanü bərməla,
Künhi-zatında müəttərdir cəmii-masiva.

Kimdə xəlq olmuş o idrakü o fəhmü əqlü huş,
Kim xəyali-zatının tənzihi etsin iddia.

Sən o Xaliqsən ki, əvvəl xilqətində ənfüsin,
Adəmi xəlq eylədin ayineyi-vəhdətnüma.

Sənsən ol gövhər ki, bir sərraf görmübdür Səni,
Ta ki, şə’nü rütbəvü qədrincə qoysunlar bəha.

Bir müəssirsən sən, asarın təmamən kainat,
Hər əsərdə qoymusan bir ibtida, bir intəha.

“Külli-nəfsin halikun”[1] vəchindi baqi, ey qədim,
Yoxdur əsla zatın üçün intəhavü ibtida.

Mehrin, ey məhbubi-aləm, oldu aləmgir mehr,
“Zatikə nurun mühitun kəş-şümusu bid-düca”.[2]

---

[1] Qisəs surəsi, ayə 88. Onun özündən başqa hər şey məhv olandır.
[2] Zatın qaranlıqları yaran günəşlər kimi hər bir şeyi əhatə edən bir nurdur.

Biz "Yəfirrul-məcrü yovmini min əxihi"n[3] məqsədi,
Sənsən ol mədluli-"Ərrəhman ələl-ərş istəva".[4]

Qandan istinbat edər naqis kəmal ol məxzəni,
"Cövhərun məknun dürriyu min əknazül-xəfa".[5]

Sənsən ol kənzi-xəfi, dəryayi-vəhdət gövhəri,
Nurinin asarı Quran, məzhərindir ənbiya.

Gərçi "əhbəbtu" buyurmuş Həq, "ənü'rəf" [6]kəlməsin,
Ey Müniri, kim yetər ol kənzə ki, olmuş xəfa.

* * *

Cəmalın əksidir gülgun qılan cami şərabasa,
Və ya yaquti meydir, cilvə eylər afitabasa.

Cigər qanı sirişkimlə gələr rüxsarə peydərpey,
O gündən kim yanar eşq atəşində dil kəbabasa.

Gözümdə saxlayardım əksi-ruyin hər şəb, ey məh, gər
Tutaydı üns bir şəb mərdümi-çeşmimlə xabasa.

Tutub piri-muğanın damənin mey nuş qıl, ey dil!
Oturma parsalıq sayəsində şeyxü şabasa.

---

[3] Əbəs surəsi, ayə 34. Yövmə yəfikkül-mər'ü min əxihi: O gün (qiyamət) insan öz qardaşından qaçacaq.
[4] Taha surəsi, ayə 5. Mərhəmətli Allah (qüdrət və hakimiyyəti ilə) ərşə hakim oldu.
[5] onun məxfi olan cövhəri gizli xəzinədən olan bir dürrdür.
[6] Hədisi-Qüdsi: Mən gizli bir xəzinə idim. Mən tanınmaq üçün xilqət aləmini yaratdım.

Vücudum kəştisin tufani-hicrin öylə qərq etdi,
Gəzər can lüccələrlə bəhri-heyrətdə hübabasa.

Dəgəndə naxuni-həsrət tənim tarına çün mizrab,
Açar razi-dərunim pərdə-pərdə dil rübabasa.

Ərəq tək feyzi-ruyin kəsb qıl, əğyarə faş etmə,
Buraxma hər cühəlxasiyyətə ətrin gülabasa.

Şəbi-hicrində min surax açıb cismimdə gərdun tək,
Nigara, fikri-hər noki-müjən tiri-şəhabasa.

Müniri, bəhrü kan ol, gövhərü yaqut çək nəzmə,
Təravətbəxşi-gülzari-məani ol səhabasa.

*1917*

* * *

Tut mülki-hüsni ləşkəri-zülfi-siyahilə.
Ey xosrovum ki, səltənət artar sipahilə.

Görcək qədin, xəmidə qaşın, könlümə dedim:
Vəh, qiblə gör nə rast düşüb qibləgahilə.

Yandırdı xərməni-fələki atəşin, könül,
Dövri-sipehri çulğaladı dudi-ahilə.

Dövri-rüxün tutub xəti-novxiz, guiya,
Güldür ki, dəstə bağlanıb ehya giyahilə.

Xurşidü məhdə yox o lətafət ki, səndə var,
Vardır yeri ki, bəhs edəsən mehrü mah ilə.

Zahid meyi həram deyir, fe'lini günah,
Ey kaş, hey keçəydi günüm bu günahilə.

Tacü külah isə qərəzin gər, Müniriya,
Qıl tərki-sər ki, baş ucalanmaz külahilə.

* * *

Zülfin tutub dolannam, çün şanə yar əlində,
Söylər görən, nə tutmuş divanə mar əlində?

Məstanə gözlərindən qıl nəşə hasil, ey dil!
Ta hər nə qədr yarın peymanə var əlində.

Gül ruyivün xəyalı şeyda qılubdu könlüm,
Hərdəm gəlir çü bülbül əfğanə xar əlində.

Zülf ilə xalü xəttün zikrin bilirmi zahid?
Təsbih edib, edər zikr, əfsanə var əlində.

Rəqs ilə mövləvilər zikri-ləbin tutarlar,
Canan gələndə bəzmə məstanə tar əlində.

Əzzəldə nari-eşqə pərvanə şəm'i yaxdı,
İmdi çü şəm' qalmış pərvanə nar əlində.

Çün zülfi-yarə bəndəm, çəksə, Müniri, gəlləm
Zənciri-zülfi ilə hər yanə, yar əlində.

* * *

Adəm övladında sən tək görməmişdim ruhi-pak,
Gəndümi-xalın görüb çün gəndüm oldum sinəçak.

Aldı əqlü huşumu, məstanə qıldı könlümü,
Çadıri-səbz içrə ta göstərdi ruyin rəsmi-tak.

Bu gülüstan kim, görürsən əksi-ruyindir sənin,
Bağiban gözlər təravətbəxş olur xurşidü xak.

Göz yumub açıncə verməz fürsət ərzi-hal edim,
Mərdümi-çeşmin verir fətva, qılır qəmzən həlak.

Rövşən et giryan qəmin cananə, gülsə şəm' tək,
Sən dolan başına çün pərvanə, hərgiz qılma bak.

Nərgisi-məstin xəyalilə, gülüzlüm, sübhə tək
Bülbüli-şuridə tək bidar mən, sən xabnak.

Ey Müniri, qıl Minayi-eşqdə təslimi-can,
Ta görənlər söyləsinlər mərhəba, "haza", fədak[7].

* * *

Təbiət ruhlənməz növi-insan olmayan yerdə,
Gülüstan ətrlənməz ətri-reyhan olmayan yerdə.

Məarif rüşd tapmaz olmasa təşviqi-ürfani,
Məkatib qədrlənməz elmü ürfan olmayan yerdə.

Məhəbbət töxmin əkməz mehrü ülfət bilməyən dehqan,
Əmanətpərvər olmaz nəfs, vicdan olmayan yerdə.

---

[7] O fəda oldu sənə.

Əmanət tərk olunmaz açmasa üz şahidi-məqsəd,
Mürüvvət cilvələnməz ədlü mizan olmayan yerdə.

Məarif şəklə düşməz etməsə gər ciddü cəhd arif,
Nəmüvv asarı olmaz mehri-taban olmayan yerdə.

Dili-fulad üçün həddadi-xoşkirdar lazımdır
Ki, ahən seyqəl almaz fikri-suhan olmayan yerdə.

Müniri, murlər seyr eyləyür əflaki, qafilsən,
Süleymani büsat içrə, Süleyman olmayan yerdə.

*"Ədəbi parçalar", 1926*

* * *

Sən o gülsən, rəng vermiş ləblərin gülbərginə,
Səndədir feyzi-təmaşası gülün hər renginə.

Yarın ecazi-dəhanın istəməz hər göz görə,
Zahidin bax zövqünə, büxlinə, çeşmi-tənginə.

Gedməz aləmdə büsati bircə gün bərhəm tapar,
Gər Süleyman baxsa təhqir ilə muri-lənginə.

Baxəyal ol, yadə sal Cəmşidi, cami-mey götür,
Çox da pabənd olma dəhrin əfsərü övrənginə.

Niknamilə gəz, istərsən həyati-cavidan,
Bağlama bel bu cahanın rənginə, neyrənginə.

Ey könül, mizani-ədl ol, varsa vicdanın əgər,
Dəysə gər hər anda başın min məlamət sənginə.

Şuxi-şəng əyyamə keçdi, imdi himmət vəqtidir,
Olma sərgərm aləmin ya şuxuna, ya şənkinə.

Əhli-dil məhbubidir növin hüququn gözləyən,
Salmasın əğyari-bədbinin zəlalət çənginə.

Ey Müniri, söhbəti-ürfanı əxz et, vermə guş
Naşının hənginə, çənginin sədayi-çənginə.

* * *

Ləbin dəhanı ki, isbat edər kəlamə gələndə,
Qədin qiyaməti nəf’ eyləyir xüramə gələndə.

Əgər nəsimi-səba töksə çini-zülfün üzarə,
Şəmimi ruhi-Məsihi verir məşamə gələndə.

Gər oxşadıbsa qaşın taqinə hilali məhi-növ,
Görür təfavütü yerdən göyə təmamə gələndə.

Bir oxdu hər bir müjganın, ey ürək sevən afət,
Olurmu can qutara səf çəkib nizamə gələndə.

Siyah zülfü çəkib səf aradə padşəhi-hüsn,
Hilali-eyd qaşın gör sipəh səlamə gələndə.

Tutubdu mülki-Süleymanı muri-xəttü cəmalın,
Oxur sifatini Asəf əlində namə gələndə.

Müniri nəyyiri-ə’zəm məqamını sənə vermiş,
Ülüvvi-fikr ilə ver feyz hər məqamə gələndə.

* * *

Bax nigarım, odlu dildən ərşə çıxmış ahimə,
Gör nə odlardır salıb hicrin dili-agahimə.

Səbr qurtarmış, əcəl yetməz verəm kuyində can,
Kim bu halilə yetirsin ərzi-halim şahimə.

Yandırır doqquz sipehrin kövkəbin ahim odu,
Gər sala mehrin fələk xurşid üzlü mahimə.

Gər qiyam etsən bu qəddü qamət ilə həşrdə,
Üzr göstərrəm səni ancaq o gün Allahimə.

Etcək ümmidi-vüsalın qıldı istiqbali-hicr,
Urdu naümmidlik od xeyməvü xərgahimə.

Badə tək düşdüm əyağə, ta ləbindən kam alım,
Qönçə tək qan oldu bağrım, yetmədim dilxahimə.

Cənnət istərsən, Müniri, vaizin vəzin eşit,
Hər sözü başdan-ayağa bir cəhənnəm vahimə.

* * *

Ey kəmanəbru, bu gün müxtəssdir əbru sənə,
Xali-hindu, xəttü geysu, nərgisi-cadu sənə.

Bağlıdır divanə dil bir zülf zəncirində kim,
Həlqə-həlqə, mubəmu adlanmış ol geysu sənə.

Ətrü budir sevdiyin, ey gül, nəsimi-sübh tək,
Ətrü buyin gülşəni tutmuş, nə lazım bu sənə.

Sən özün bir ahuyi-xoşxəttü xal idin, bu gün,
Ey gözün qurbanı, bənd olmuş iki ahu sənə.

Nisfi-şəb seyr eyləmək vəsfin deyil, ey mahru,
Gözlə nöqsan verməsin gördükdə hər bədgu sənə.

Şərh edilməz nöqtə - ağzından, miyanından - kəmər,
Şəklsiz, mövhumsuz gəl mən deyim mu-mu sənə.

Şəm’ tək yandırdılar, verdin Müniri nurini,
İmdi atəşparələr od yandırır hər su sənə.

* * *

Mən ilə bu dilü can aşinadır hər ikisi,
Nə sud, bir sənəmə mübtəladır hər ikisi.

Demə üzündə iki zülfdür ənbərəfşan,
Gəzərlə Rumdə, əhli-Xətadır hər ikisi.

Qaşın mühitinə dara olan o mərdümi-çeşm,
Səfinə içrə gəzən naxudadır hər ikisi.

Gözün gözünlə cüdalıq salıb, qaşınla qaşın,
Cəhanə fitnə salan bir bəladur hər ikisi.

Çü sübhi-kazibü sadiq nəfəs vurub gəzmə,
Günəş çıxar, bilinir bibəqadır hər ikisi.

Müniri, mal ilə övladə şad olub durma,
Çox imtəhan olunub, bivəfadır hər ikisi.

* * *

Bir dəlirik biz, bədbəxt, hünərdən xali,
Bir nihalıq ki, əbədliklə səmərdən xali.

Bir sipehrik ki, onun əncümənü kövkəbi yox,
Bir səmayıq ki, o xurşidü qəmərdən xali.

Ruhsuz bir bədənik, nitqi-Məsiha lazım,
Meyi-şirin-şəkərik, leyk şəkərdən xali.

Tutiyi-natiqəmiz ayineyi-fikri-təmiz,
Kim deyil nəqsdən, ənduhü kədərdən xali.

Danışan dil varımızdır, vəli bihudə yerə,
Həm görən göz varımız nuri-bəsərdən xali.

Tapmadıq hüsni-ədəb, tərbiyəti-aləmdə,
Eləməz yeksərə tarixü xəbərdən xali.

Nasehin eylədiyi pəndü nəsihət bica,
Vaizin vəzini gör, kəsbi-əsərdən xali.

Bihəvəs işləməyin etdi, Müniri, səni heç,
Qaldı ceybi-həzinin sikkəvü zərdən xali.

*"Dirilik", 16 yanvar, 1916*

* * *

Tut könül, üftadəlik sərriştəsin geysu kimi,
Şəm tək uyma həvayə, çəkmə gərdən qu kimi.

Çün zəbani-yar pünhan saxla sirrin qeyrdən,
Mərdümə faş eyləmə hər gördüyün güzgu kimi.

Xirə gözlü olma çün nərgis çü sərvazadə ol,
Axma hər bir sərvqamət gördüyün dəm su kimi.

Şahbaz ol, seyd qıl çün çeşmi-yar, ey canü dil,
Açma acizlik qanadın hər yana tihu kimi.

Etmə aşiq könlünü aşüftə, çün geysuyi-yar,
Gördüyün bildirmə göz tək, başın əy əbru kimi.

Şişə tək sərmöhr qıl ağzın çü susən, açma dil,
Vermə hər şəb ətrü bu şirin güli-şəbbu kimi.

Gər mərizi-eşqsən, əğyarə dərdin qılma faş,
Təlx göftarın nigarın nuş qıl daru kimi.

Şanə rəşkin bəski qıldım zülfi-canan muyinə,
Rəşki-padaşilə tən incəldi tari-mu kimi.

Eylə təkrar, ey Müniri, ruzü şəb Həq kəlməsin,
Gər çəkilsən darə Mənsuri-ənəlhəqgu kimi.

* * *

Nə kəman zehsiz olur ol xəmi-əbru kimisi,
Nə kəmandar olur ol nərgisi-cadu kimisi.

Demək olmaz görükən muyi-miyanındır, leyk,
Gəlir ancaq kəmər içrə nəzərə mu kimisi.

Sərvü şümşad olamaz rast xüram etməyə laf,
Məgər ol qaməti-rəna kimi, dilcu kimisi.

"İn yəkad"[8] ayəsini eylə həmayil, sənəma,
Ki, məbada nəzəri-bəd ura bədgu kimisi.

Kəc nigah ilə kəc et fərqdə tərfi-küləhin,
Ki, durub baxmaya vapəs neçə ahu kimisi.

Zahidin sübhəsini dam deyirlərdi, dedim,
Ola bilməz ola ol xal ilə geysu kimisi.

Can alır derlə, Müniri, o pərilər şahı,
Dedim, ey sadə, inanma ki, ola bu  kimisi.

* * *

Məst edib fitnə gözün ol ləbü xal ilə məni,
Qıldı divaneyi-zülfün məhü sal ilə məni.

Fikri-vəslinlə gəhi şad, gəhi məhzunəm,
Öldürür firqətin, ey məh,  bu xəyal ilə məni.

Tənim ol qədr zəif oldu qaşın fikrində,
Fərq verməz görə eşq əhli məlal ilə məni.

Nəməkin xalın ilə çox gecə sübh eyləmüşəm,
Ölürəm indi fəraqində, həlal eylə məni.

Leyliveş yar ilə həmsağərəm, ey canü könül,
Qeys görsə olu Məcnun bu cəlal ilə məni.

[8] "Qələm" surəsi, ayə 51-52 - Və in yəkadül-ləzinə (nəzər duası).

Malü canım çü, Müniri, elədim yarə fəda,
İmtəhan eyləyir amma o mənal ilə məni.

* * *

Elm etdi rövşən, ey dil, təriqi-Avropani,
Təriq edib cəhalət rövşəndil Asiyani.

Nur olsa idi gözdə, elmin yolun tapardıq,
Əql olsa idi kamil, əxz eyləyərdik ani.

Mövhumə allanıb dil, cəhl oldu əqlə qalib,
Əfkarımız pozuldu, məqsədlər oldu fani.

Varü yoxu itirdik təhsili-kimiyadə.
Elm ilə hasil etdi Avropa kimiyani.

Təhqiqsiz söz oldu əfkarımız cahanda,
Bir boş fəsanə bildik keyfiyyəti-cəhani.

Hər nə dedi inandıq dərvişü sufi, zahid,
Sərbəstə qaldı yekca əsrari-asimani.

Tariklikdə itdi əfkarımız, Müniri,
Əxlaqımız dəgişdi, bəlli olub ziyani.

* * *

Dıriğ, cövhəri-insan bilinmədi, qaldı,
Bu cismə cilvə verən can bilinmədi, qaldı.

Bahari-mərifətin gülləri açıldı  təmam,
Həzarə eyləyən əfğan bilinmədi, qaldı.

Nəsimi-sübh yetirdi məşamə gül ətrin,
Vəleyk ətri-gülüstan bilinmədi, qaldı.

Meyin nə olduğunu etdi piri-meykədə faş,
Vəli o nəş`eyi-pünhan bilinmədi, qaldı.

Neyü nəva bizə verdikdə nayinin xəbərin,
Əsasi- nayü neyistan bilinmədi, qaldı.

Təbiət etdi müxalif qüvvələr ilə zühur,
Təbiəti qılan ünvan bilinmədi, qaldı.

Bilindi səltənəti-mur, dövləti-zənbur,
Büsati-mülki-Süleyman bilinmədi, qaldı.

Oxundu Xosrovü Şirin hekayəti kəmü biş,
Vəleyk məxəzi-ünvan bilinmədi, qaldı.

Güm etdi Yusifi Misrin əzizi axırda,
Nə oldu mövcibi-zindan bilinmədi, qaldı.

Müniri bildiyini əhli-halə qıldı bəyan,
Vəli bu hali-pərişan bilinmədi, qaldı.

* * *

Aləmi-islamı tutmuşdur cəhalət yanğısı,
Dəstü pa vurduqca artar bu zəlalət yanğısı.

Yanmağa tən vermişik həyyi-məqami-cəhldə,
Bir könüldə görmədik əsla nədamət yanğısı.

Bülhəvəs dəryüzələr kimi dolandıq ruzü şəb,
Yandırıb dil mülkünü yeksər kəsalət yanğısı.

Yanarıq od içrə, əsla bilmərik biz od nədir,
Bəs ki yandırmış üruqi bu fəlakət yanğısı.

Bilmədik himmət nədir, qeyrət nədir, cünbiş nədir,
Çün düşüb biz millət içrə bu nəcabət yanğısı.

Xoşladıq biz ittihad əmrin, rüsumin bilmədik,
Payimal etmiş bizi yeksər əsarət yanğısı.

Felimizlə qövlümüz bir  ləhzə pabərca deyil,
Zərrəcə bizlərdə yoxdur istiqamət yanğısı.

*"Dirilik", 16 aprel, 1915*

* * *

Əzmi-bağ etsə gər, ey munisi-can, can sənsiz,
Azəristan olur ol səhni-gülsitan sənsiz.

Gülə sənsiz əl uzatsam  əgər, ey qönçədəhan,
Qönçə bağrı kimi olsun cigərim qan, sənsiz.

Dağdən sinəsini görməyəcək xali, əgər
Eyləyə dağləri lalə çırağan sənsiz.

Payibəst oldu, görüb şiveyi-rəftarını sərv,
İstədi ta ola ahəstə xuraman, sənsiz.

Qönçənin bağrını qan eylədi bağrım kimi əşk,
Ta dedim rəmzi-dəhanın ona pünhan, sənsiz.

Gördü lə'li-ləbini, rəng verib rəng aldı,
Oldu aludə gilə ləli-Bədəxşan, sənsiz.

Nə səfası çəmənin, nə fərəhi gülzarın,
Gər Müniri görə yüz bağü gülüstan, sənsiz.

* * *

Bir ahu gözlüyə seydəm ki, hər səyyadə ram olmaz,
Kəməndi-zülfünün pabəndiyəm, ömrüm təmam olmaz.

Gözün qurbanı, cəm' et, ol pərişan zülfi rüxsarə
Ki, sərxoş padşəh mülkündə nəzm olmaz, nizam olmaz.

Xədəngi-nazının qurbanıyam, ey can alan dilbər,
Bir ox lütf etməyinlə zəxmi-hicran iltiyam olmaz.

Dəhanın var-yox bəhsində varü yoxdan əl çəkdim,
Sütudə zikrlər zikr etməsən, xətmi-kəlam olmaz.

Könül guya səadət ilə meydan içrə külbaşın
Ki, çövkanbaz olub yarım, belə ali məqam olmaz.

Olur bihudə məbhəs bəhsi, ey zahid, həram olsun,
Məhəbbət məclisində sərf olan bir mey həram olmaz.

Müniri tək bu gün bədnamlıq şəhrində məşhurəm,
Bəli, rüsvayi-eşq aləmdə hərgiz niknam olmaz.

* * *

Baharım gəlməsə, ey dil, açılmaz gül, bahar olmaz.
Sürudi-əndəlib olmaz, gülüstan ətrbar olmaz.

Əcəb olmaz qürubun görcək düşəm gər sayə tək xakə,
Günəş düşməzsə xakə, sərbüləndi-ruzigar olmaz.

Bu ümmid ilə səndən çəkmərəm əl, leyliveş dilbər,
Xəmi-zülfün kənarından dili-Məcnun kənar olmaz.

Xoşam hicr atəşində, yar, vəslinlə yanam daim
Ki, qalə girməyən zər, doğrudur, kamiləyar olmaz.

Olub gər, ey məhi-nəxşəb, nigarıstani-Çin şəhrə,
Vəli, əksik görən gözlər, bu surətdə nigar olmaz.

Mənə bir iltifat ilə nigah etdin, dedim ey məh,
Belə bir xoşnigah ahu şikar canşikar olmaz.

Müniri, lə'li-nabın şəhdini dadmıbsa aləmdə,
Nə qədri aləmitəb olsa, kəlami abdar olmaz.

* * *

Göstər o xalü lə'lini, cana, bəhanəsiz.
Ta ki könül quşi dolana abü danəsiz.

Cəm' eylə zülfün, hifz ola ta gənci-hüsni kim,
Nə əmirsiz sipah olu, nə şəh xəzanəsiz.

Şəm'i-rüxün görüb dil açar atəşin, könül,
Pərvanə bizəbansa, od olmaz zəbanəsiz.

Suzi-dərcuni pərdeyi-sinəmdən, incimə,
Bir tari-ahü nalədir, olmaz təranəsiz.

Al nəqd canı vəslə əvəz, dil tuta qərar,
Sövda mühəqqəq olmayır, olsa bəhanəsiz.

Qoy bir qoyum üzüm üzünə, bəlkə zülfünü,
Məşşatə tək müjəmlə qılım şanə, şanəsiz.

Sinən dəf ilə tar, vücudun çəğanə kim,
Gəlməz, Müniri, şurə müğənni çəğanəsiz.

* * *

Gəldi livayi-səltənətilə cahanə türk.
Verdi nişan hilalı qaşın asimanə türk.

Etdi rəvaqi-noh fələki səltənətnişin,
Əsgərligə nücumi çəkib mahiranə türk.

Etdi Ütaridə qələmin bəs sərii-tiz,
Minşiligində çəksin onu imtəhanə türk.

Mirrixi qanlı dəstəsinə eylədi əmir,
Bir şəqəl görsə naləsin gəh ola vəhşiyanə türk.

Yol göstərən qoyub bu rəhin adını şikar,
Səhradə yol nişan verə hər karivanə türk.

Tiri-şəhabi oxçulara nazir eylədi,
Də’vadə səhvə getmiyə heç bir nişanə türk.

Sübh ulduzun qəravul içün etdi pişrov,
Yığdı piyadə əsgərini Kəhkəşanə türk.

Dərya kimi təlatüm edə hər zəman hərif,
Bürci-fələkdə xəndəq aça xanə-xanə türk.

Bir gün, Müniri, Əhriməni surə döndərir,
Təng eyləyir bu mülki-Süleymanı anə türk.

* * *

Səni, Həq, tək yaradıb, ey büti-ziba, özü tək.
Bir gözəlsən, sənə nə ğazə gərəkdir, nə bəzək.

Lalə tək bağrıma bir dağ qoyub xalü xətin,
Dağdən xali üzün həşrə kimi görməyəcək.

Əzmi-bağ etdiyini müjdə verib bağə səba,
Sübh açılcaq açılıb çıxdı təmaşayə çiçək.

Danış, al canımı, ey cövhəri-can, etmə sükut,
Nəzər et, həsrəti-didarına, qan oldu ürək.

Ruyivün mailü sərgəştəsidir sübhü məsa,
Dolanır həsrətin ilə məhü xurşidü fələk.

Zəri-təbimi qılıb eşqin odu dəstəfşar,
Qaşsız bir qızıla daxi nə lazım bu məhək.

Xaki-payin çü Müniri öpərəm ta varəm
Ki, qoyub şəhdi-ləbin boynuma bir həqqi-nəmək.

* * *

Bəççeyi-dəllak tökdi cami-simin içrə ab,
Oldu hər bir qətrə ab, aşiq baş açdı, çün hübab.

Ərğəvani futə saldı boynuma bir əldə tiğ,
Qanımı tökdükdə mərdüm etməsinlər qan hesab.

Çırmayıb saidlərin su aldı fövrən camdən,
Səpdi gülbərg əllərilə başə peydərpey gülab.

Çərxə çəkmiş tiğini, aldı çü büllurin ələ,
Qaçdı çərxə rəşkdən, tiğin buraxdı afitab.

Açdı ta ol səngdil, nərmək əlin başım tərəf,
Başımın sevdası artdı, tapdı çeşmim iztirab.

Tiğinə verdikcə seyqəl, oldu dil mir'ati saf,
Etdi baş verməkliyə şövqilə muyi-sər şitab.

Muyi-sər ol müştmalın gördü, qıldı tərki-sər,
Kim, deyil insaf tiğü sər ara olmaq hicab.

Yox Müniri, muzdi-dəst əldə, verim cüz nəqdi-can,
Neyləyim, qoymub qala bir vəch cüz can inqilab.

* * *

Könül, seyd olma hər səyyadə, hər nə seydə səyyad ol.
Əgər izzət sevərsən, nəfs zəncirindən azad ol.

Məhəbbəttalib ol, ülfəttəmənna mərhəmətayin,
Güşadəcübbə ol, əxlaqi pak ol, dəsti-imdad ol.

Fərəhbəxş ol, qəməngiz olma, münsif ol, şərir olma,
Ədib ol, kamil ol, hər fikrü tədbirində ustad ol.

Hərir ol, məşvərət bəzmində asayiş ver afaqə,
Nə müşkül nüktə olsa, həllinə bir kilki-fulad ol.

Əgər şəkkər təmənnasındasan, Xosrovlıq izhar et,
Və gər şirin görərsən tişə zəxmin, onda Fərhad ol.

Əgər geysuyi-yarı telbətel gəzməksə məqsudin,
Bu əfkarında əvvəl payədə bir nəxli-şümşad ol.

Cahanın dərdü ənduhindən azad olmaq istərsən,
Müniri tək bu afaqın qüyudatından azad ol.

* * *

Surəti-insan, könül, bir nəqşi-dünyadır gözəl.
Kilki-təsviri-müsəvvirdən bir inşadır gözəl.

Əhsənüt-təqvim mafövqüt təsəvvür xilqəti,
Bir bəşərdir maliki-“əsmai-hüsna”dır gözəl.

Bir mürəkkəbdir ki, tərkib olmuş onda nuri-Həq,
Müqtədir bir zati-aliqədri-danadır gözəl.

Bəslənən neysani-rəhmətlə sədəf xövfündə kim,
Rəhmi-madərdən gələn bir dürri-yektadır, gözəl.

Ruhlənmiş nuri-vəhdətlə buneyyi-əsldə,
Nəş'ələnmiş bir mey ilən kim müsəffadır gözəl.

Surəti-adəmdə təşkil olmuş ol həqq ayəti,
Həm bu gün nəslində peydavü hüveydadır gözəl.

Ey Müniri, gör nə surət bağlayıb bir qətrə tər,
Kim təsəvvür aləmində eyni-mə'nadır gözəl.

* * *

Vəslə çün pərvanə yetsən yanacaqsan, ey könül.
Şəm' tək hər əncüməndə xah ağla, xah gül.

Eşq odunda yan, könül, daim səməndərtaqət ol,
Şö'lə tək qalxma həvayə, yansa varın cüzvü kül.

Badəni şirin ləbin təlx etdi, gül ruyini sürx,
Bəhs edilməz daxi lə'linlə nə mül, nə bərgi-gül.

Atəşi-eşqə Xəlilasa gəl, ey dil, vəcd qıl,
Gülsitani-Həq təmənnasında, cismin olsa kül.

Gör nə xoşməşrəbsən, ey məh, mey əyağından öpər,
Arizindən cilvə eylər afitabi-cami-mül.

Aləmi-təcriddə, gəl qıl, əvalim seyrini,
Ey könül, qeyd aləmi aləmdə bir aləm degil.

Mərifət istərlər insandan, Müniri, nə libas,
Nitqsiz heyvanə artırmaz şərəf zərduz çul.

* * *

Yetişdi mövsümi-hicran, dəmi-xəzan, ölürəm.
Bahari-vəslinə yoxdur dəxi güman, ölürəm.

Olub vətən mənə qürbət, qəmi-fəraqın ilə,
Nə munisü nə ənisü nə həmzəban, ölürəm.

Sirişki-qəm tökərəm şeh təki şəbi-hicran,
Yetişməmiş dəmi-sübhi-vüsalə can, ölürəm.

Bu axərin nəfəsimdir, dəmi-xəzanımdır,
Bahari-vəslinə yoxdur dəxi güman, ölürəm.

Cəmalının gülünün əndəlibiyəm şəbü ruz,
Eşitməsən[9] nə qədər eyləsəm fəğan, ölürəm.

Rəqib tə'nələrin, el məlamətin çəkərəm,
Haçanacan qəmim eldən edim nihan, ölürəm.

Sitarələr yanır aəhvalıma, sən, ey zalim,
Tərəhhüm eyləməsən, etməsən[10] güman, ölürəm.

Yetişmədin qəmimə ol qədər ki, yetdi əcəl,
Gəl imdi gör məni bu halilə, inan, ölürəm.

Məhəbbət aləminin iqtizasıdır, bu sözüm,
Müniri, nəzm ilə yaz, qoy qala nişan, ölürəm.

---

[9] eştməzsən
[10] etməzsən

* * *

Gəh salıb rüxsarə zülfün, gəh açıb ruyin təmam,
Aləmə bildirdin, ey məhparə, nəymiş sübhü şam.

Daneyi-xalın görüb pərvazə gəldi mürği-dil,
Qafil ondan kim qurulmuş qəsdinə zülfünlə dam.

Gizlənib xalın ləbin küncündə, oldur məqsədi:
Şayəd əsrari-dəhanından eşitsin bir kəlam.

Sərvboylum, seyri-bağ etdikdə, küllən sərvlər
Nazlı rəftarın görüb pabəstə olmuşlar müdam.

Açdı zülfün, tökdü rüxsarə, töküldü ayü gün,
Mərdümi-çeşmim kimi heyrətdə qaldı xasü am.

Ləblərin abi-bəqa, zülmati-xətt içrə nihan,
Xızr xalındır tutan abi-həyat üstə məqam.

Növki-müjganından ox gəldikcə, al, bas bağrına,
Ey Müniri, vəsldən bu bir xəbərdir, vəssəlam.

*"Türkcə qəzəllər", 1917*

* * *

Eşqində, ey sənəm, nə qədər varəm, ağlaram.
Hicranına nə qədr giriftarəm, ağlaram.

And olsun ol qəra gözüvün bir nigahına,
Yox çarə dərdi-hicrüvə, naçarəm, ağlaram.

Salmış gözün xəyalı məni bəstəri-qəmə,
Yetməz əlim vəslinə, bimarəm, ağlram.

Qıldım xəyali-vəslini hər şəb səbahədək,
Ağlarəm, ağlaram, yenə ağlarəm, ağlaram.

Zülfü rüxün xəyalı alıbdır qərarımı,
Divaneyi-o arizi-gülnarəm, ağlaram.

Nə səngdilsən, ey şəbi-hicran, tükənməsən,
Ta sübh bilmənəmmi ki, bidarəm, ağlaram?

Yoxdur məlamət, ah çəkib, nalə eyləsəm,
Bir od edib bu aləmi odlarəm, ağlaram.

Şərhi-qəmi-fəraqı, Müniri, tamam qıl,
Bir aşiqəm ki, həsrəti-didarəm, ağlaram.

* * *

Bülbüləm, ey güli-şəbbu, çəmən avarəsiyəm,
Müşkbu zülfünə bəndəm, Xütən avarasiyəm.

Qumrivəş sübhü məsa naleyi-ququdur işim,
Qəddi-ruyin kimi sərvi-səmən avarəsiyəm.

Mən o Mənsuri-ənəlhəq deyənəm, yox eşidən,
Dari-dünyadə dolannam, rəsən avarəsiyəm.

Tazə-tazə töküb iç qanımı, ey müğbeçə kim,
Künci-meyxanədə rahi-kühən avarəsiyəm.

Gəl-gəl, ey canım alan, gərdi-rəhin gözləyirəm,
Mən şəhidi-rəhi-eşqəm, kəfən avarəsiyəm.

Xosrovim, tişeyi-eşqin çalaram, insaf et,
Kuhkən tək mən o şirinsüxən avarəsiyəm.

Tifli-gəhvareyi-ağuşinəm, aç püstanın,
Çün Müniri, gecə-gündüz ləbən avarəsiyəm.

* * *

Kimə aşiqsən, olubsan belə giryan, ey şəm'?
Rövşən et dərdi-dilin, saxlama pünhan, ey şəm'.

Məclisi-eşqdə pərvanədən aldın tə'lim,
Ta səhər odlanasan etməmiş əfğan, ey şəm'?

Başını kəsdikicə, atəşi-eşqin artar,
Sana qurban ola pərvanəsifət can, ey şəm'.

Necə fulad dil olsa, əriyir atəş ara,
Səni görsə gəhi giryan, gəhi xəndan, ey şəm'.

Ömrünün axırıdır, razi-dilin rövşən qıl,
Sübh olur indi xumar mehri-dirəxşan, ey şəm'.

Bilmədi dərdini hər haldə cüz pərvanə,
Bir şərarı ona həm eylədin ehsan, ey şəm'.

Atəşi-eşqdə yandıqca olursan xəndan,
Qalmışam halına hər haldə heyran, ey şəm'.

Doldurub damənini seyli-sirişkin gecələr,
Alışıb tari-vücudun yanır hər an, ey şəm'.

Düşmüsən ta ki, Müniri kimi eşq atəşinə,
Açma dil bir kəsə, pəranəsifət yan, ey şəm'.

* * *

Ey qan olan könül, niyə düşdün bu halə sən?
Başdan-ayağə ney kimi bir ahü naləsən.

Bəsdir bu içdiyim qəmi-eşqində xuni-dil,
Gəl bir piyalə mən götürüm, bir piyalə sən.

Sevdikdə mən səni, unudub əqrəba məni,
Gəl başım üstə, can verirəm, laməhalə sən.

Çıxmaz bu can, gözətlər o müjganların oxun,
Ey qaşları kəman, elə bir ox həvalə sən.

Olmuş səməndəranə yerim eşqin atəşi,
Gəl bir tərəhhüm eylə, nəzər qıl bu halə, sən.

Görmə rəva vüsalına yetsin səba sənin,
Bir dağlı aşiqi olan, ey şux, laləsən.

Varımsa səndən özgə, o həm bir bu candur,
Bu canı məndən almağa eylə əcalə sən.

Çoxlar demiş bu həsrəti, mən həm baxıb dedim:
Ey qan olan könül, niyə düşdün bu halə sən?

Bir gün gəlir zəman özü də yad edir səni,
Yaz qoy, Müniri, halına dair məqalə sən.

* * *

Əgərçi bülbülə xoşdur edən cəfası gülün,
Vəli nə sud nə hasil ki, yox vəfası gülün.

Gözünə xar batar bülbülün baxanda gülə,
Əgərçi yox nəzərən xarə e’tinası gülün.

Dözər cəfasına bülbül, gül eylər işvəvü naz,
Bü bülbülün işi, bu etdiyi ədası gülün.

Vurubdu gül üzə ğazə, geyib libasi-hərir,
Deyir gərək ola bülbül bu gün fədası gülün.

Xəyali-bülbülü əndişeyi-gülü bilsə,
Açıqdı bülbülün əfkarı, iddiası gülün.

O cövr kim, gül edib əndəlibə fəsli-bahar,
Gəlir xəzan dəmi, hər gün çıxır sədası gülün.

Qələm, Müniri, olub sinəçak, bildikdə
Ki, bülbül ilə keçibdir nə macərası gülün.

* * *

Aşiqin kimdir dedim, ey şuxi-rəna, sən-dedin,
Afəti-canım - dedim sənsənmi, güldün, mən-dedin.

Söylədim mə’şuqə üşşaqın yaxarmış atəşə,
Eşq rəsmin şəm’dən-pərvanədən öyrən, dedin.

Hər iki kitfində gördüm həlqə-həlqə zülfüni,
Mən kəməndi-dam adın çəkdikdə sən cövşən dedin.

Daş imiş qəlbin - dedim, əcz eylərəm rəhm etməsən,
Daş dedikdə fövrən, ey məhparə,sən ahən dedin.

Görə-görə oxlarından didəmin nur aldığın,
Bir Təhəmtən söyləməkdən ona ruintən dedin.

Can deyirdim gəldigincə oxların müjganına,
Öl demək gözlərdim ağzından, fəqət əhsən dedin.

Getdi əldən var-yox, sirri-dəhanın açmadın,
Yan, Müniri, qönçə tək çak eylə pirahən dedin.

* * *

Verdi əbrusinin əksin fələkin ayinə yar,
Oldu əngüştnüma mərdümi-çərx ayinəvar.

Ramazan ayı açılcaq tutulub sövti-rübab,
Nəş`ələr başdan uçub, qalmadı cüz rənci-xumar.

Bağlanıb meykədələr, qaldı qədəhlər xali,
Oldu əfsürdə mügü müğbeçəvü badəküsar.

Düzdü bir riştəyə yüz daneyi-ənguri fəqih,
Nəş`eyi-badə gələn tək oxuya istiğfar.

Oldu xamuş sürahivü səbu, bərbətü ud,
Sövti-Davud deyəsən eylədi pünhan, müzmar.

Yığılıb məscidə təcdidi-vüzu eylədilər,
Nayü mütrib ilə rəqqas, qələndər nə ki var.

* * *

Gəh məni vədeyi-vəsl ilə o məh şad eylər,
Gahənduhü qəmi-firqətə mötad eylər.

Gəh salır türreyi-şəbgiri kimi damə məni,
Gah divanə qılıb, qüssədən azad eylər.

Ey şəkərləb, bu nə şirinlikdir lə'lində,
Etdirir Xosrova eşqin, nə ki Fərhad eylər.

Ahu gözlüm, gözün ol şivəyə maildir kim,
Seyd ikən eylər o rəftarı ki, səyyad eylər.

Hüsni-xülqün nə ki dil mülki var, abad etmiş,
Bir xərab etsə gözün, yüz ilə abad eylər.

Bu nə şeydadır, əya, mərdümi-çeşmim çeşmin
Görsə hər yerdə bir ahubeçə, azad eylər.

Tiği-əbrusinə seyqəl verir ol məh, gördüm,
Ey Müniri, mənə nə etsə, bu cəllad eylər.

* * *

Ey könül, aşiq olan can ilə canani sevər,
Hərgiz aşiq deməк olmaz ona kim, cani sevər.

Canı canan diləsə, hiç diriğ etməməli,
Nə ki, canan sevər, əlbəttə, könül ani sevər.

Səbr edən töhmətə, məhbub rizasın gözlər,
Dostunu kim sevə Yusif kimi zindani sevər.

Çəkməyən xar cəfasın, gülə yetməz hərgiz,
Gül sevən rəsmdü bülbül kimi əfğani sevər.

Gördi xalü xətin Adəm elədi cənnəti tərk,
Kişinin zövqini gör, aləmi-insani sevər.

Nə gəlir fikrinə sündüs, nə düşər yadına mişk,
Kim ki, ol xalü xətü zülfi-çəlipani sevər.

Nə qərəz sərv, nə sünbüldü, nə güldür, könlüm,
Çün rüxün həsrətidir seyri-gülüstani sevər.

Sərvqəddim, qədəmin çeşmeyi-çeşmim üstə,
Şəhdsözlüm, könül ol çeşmeyi-heyvani sevər.

Demə pabənddir ol zülfə Müniri şəbü ruz.
Hər pərişan olan, əlbəttə, pərişani sevər.

* * *

Yarın xisalı, hüsni-cəmali bir özgədir,
Şəkkər dəhanı, tuti məqali bir özgədir.

Hər gülbün üzrə qönçəvü gül var həzar ilə,
Yarın dəhani-qönçəmisali bir özgədir.

Hər ay başında mərdümə göstərsə bir hilal,
Əmma bu mahın iki hilali bir özgədir.

Hərçənd bənzəyir rüxi-dildarə lalə, leyk
Yarın xət üzrə arizi-ali bir özgədir.

Əğyar içində xalü xəti-yardən nə bəhs?
Bəzm olsa xali, söhbəti-xali bir özgədir.

Olmuş xəyali-xalü xətilə əgərçi dil,
Əmma vüsalı, söhbəti-hali bir özgədir.

Eyb etmə, gər Müniri dəhanından etsə bəhs,
Çün elmi-ğeyb bəhsü suali bir özgədir.

* * *

Gözlərin üstündə qaşın mahı bildirməkmidir?
Ya iki sad üzrə bismillahı bildirməkmidir?

Mehri-ruyin mahi-növ qaşın sipehri-hüsndə,
Mərdüm içrə tərhi-mehrü mahı bildirməkmidir?

Qaşların əngüşti-Heydərdir ki, bir düşmən edər,
Ya cəmalın qüdrəti-Allahı bildirməkmidir?

Taziyanə sanma zülfün, ol sənəm Yusif deyil,
Gər məramın atəşin bir ahı bildirməkmidir.

Xali-rüxdü, ya rüxün zülf ilə tutmaqdan murad,
Şeşdəri-heyrətdə qalmış şahı bildirməkmidir?

Ruyini açmaq, dübarə zülfini tökmək üzə,
Vəsldən ruzü şəbi-kütahı bildirməkmidir?

"Keyfə tuhyil-mövtə"[11] edənə nəfsini öldür, diril,
Məqsəd itminan üçün gər rahı bildirməkmidir.

Elmi derlər, ey Müniri, xəzmin əfvahi-rəcal,
Elmi bildirməkmidir, əfvahı bildirməkmidir?

* * *

Könlümün həsrət gözü ol şuxi-mehrayindədir,
Dinü ayinim mənim oldur ki. yar ol dindədir.

Qaşların xunrizlik fikrindədir, ey məh, müdam
Məst olub xunriz çeşmin dinü dil qəsdindədir.

"Külli-şey"[12] asari-Həqdir hamı müstəhsən, gözüm,
İxtilafü nikü bəd kim mərdümi-bədbindədir.

Ahuvəş çeşmin məni saldı Xütən səhrasına,
Zülfi-pürçinin sorağ aldım, dedilər Çindədir.

Gül hamı bir güldür, ey dil, bağiban bir, bağ bir,
Bu təfavütlər hamı ətrindədir, rəngindədir.

"Əhsənüt-təqvim"dir[13] küllən həvadis, ey könül,
Bu həvadis tərhinə canın özü təhsindədir.

Ey Müniri, olma hərcayi, dəyanətpərvər ol,
Külli-dünya ləzzəti həm dinü həm ayindədir.

---

[11] Bəqərə surəsi, ayə 260. "...Ölüləri necə diriltdiyini..."
[12] Qurani-Kərimdən "hər bir şey"
[13] "Ət-Tin" surəsi, 4-cü ayə: "Biz

## ABBAS AĞA QÜDSİYƏ NƏZİRƏ

Yüzdə zülfün bir şəbi- deycur şəklin göstərir,
O şəbi-deycurdə məh nur şəklin göstərir.

Şəmi-ruyin yad edib gəh dil yaxar pərvanə tək
Gəh sızıldar ta səhər, zənbur şəklin göstərir.

Sünbüli-zülfün səba yel oynadıqca, gül üzün
Gəh pəri hökmin qılar, gəh hur şəklin göstərir.

Arizində hüsni-xəttin bit büsat açmış bu gün,
Gəh Süleyman dövlətin, gəh mur şəklin göstərir.

Zülfiqarasa qaşın Qənbərsifət xali-ləbin,
Hər biri bir hüsnilə məmur şəklin göstərir.

Eylə məknundur dəhanın vəqti-öltarında, gər
Diqqət olsa qönçeyi-məstur şəklin göstərir.

Gəl təmaşayə təcəllasın gör o rüxsarının,
Atəşi-eşqin sinəmdə Tur şəklin göstərir.

Cami-meydən əksi-ruyin ruyivə salmış şəfəq,
Ərğəvani rəngdə nəyyur şəklin göstərir.

Gər Müniri həq tərəfdarıdır, Həqdən zikr edər,
Bu "ənəlhəq" kəlməsi Mənsur şəklin göstərir.

* * *

Sirri dildən qeyrə ünvan eyləmək düşvardır,
Gövhəri xatəmdə pünhan eyləmək düşvardır.

Hər gülüstanı neyistan eyləmək müşkil deyil,
Hər neyistanı gülüstan eyləmək düşvardır.

Gər təraş etsən daşı ayinə tək seyqəl tapar,
Natəraş insanı insan eyləmək düşvardır.

Dərdü qəmdir yeksərə asayişi-mülki-cəhan,
Dərdü qəmsiz hərgiz imkan eyləmək düşvardır.

Hər Əzizin təxtini tabut qılmaq xeyli səhl,
Hər qul oğlun Misrə sultan eyləmək düşvardır.

Bilməməyin bilsə kəs bilməkdir, amma bilməsə,
Başa salmaq, şərhi-e'lan eyləmək düşvardır.

Daşı dürr eylər təbiət hər təriq ilən ola,
Hər daşı çün dürri-qəltan eyləmək düşvardır.

Şahı şahlıqdan, Müniri, xəl' qılmaq səhldir,
Alimi elmindən üryan eyləmək düşvardır.

Tərki-tiryak qələndər eləyib sübhü məsa,
Sureyi-tövbəni, xəmr ayəsini etdi şüar.

Məscidə gəldi o həngamədə ol qaşı kəman,
Gördü mehrab qaşın, qaşın edib qiblə qərar.

Zə’fi-ruzə bədənin öylə zəif etmiş idi,
Əhməri arizi olmuşdu zəri-dəstifişar.

Görcək ol yarı bu hal ilə günüm tar oldu,
Necə ki, ay tutulan haldə aləm olu tar.

Mümkün olsaydı tutardım əvəzi-yar ilə sovm,
Olar idim onilə ruz ilə şəb ruzi-şümar.

Ya qəbul olsa idi fitr əvəzi, can nəqdi,
Ey Müniri, eləyirdim qədəmi-yarə nisar.

* * *

Bəs şəbi-hicrində yaxmış atəşin ahim çırağ,
Rişteyi-canımda əsla qalmayıb bir zərrə yağ.

Nərgisi-məstin təmaşasından ötrü  bağdə
Güllər açmış bəzmi-mey, hər lalə olmuş bir əyağ.

Qisseyi-zülfün sorub divanə sandı el məni,
Açdı əmma mubəmu aşüftə könlümdə tərağ.

Bağə gəlmək müjdəsin vermiş səba yarın, odur
Fərş salmış səbzə yaymış şaxi, hər gül bir otaq.

Bir gülüzlüdən nişandır, xəstə aşiqdən əsər,
Hər gül açılmış çəməndə, göstərir hər lalə dağ.

Nafeyi-mişki sorub, ol ahu gözlü yardən,
Guşeyi-çeşmilə verdi çini-zülfündən sorağ.

Sərv qəddin payibəndi qeyddən azadədir,
Cənnəti-kuyin görən rənci-qiyamətdən fərağ.

Göz yaşım görcək rəvan sordu səbəb canan, dedim:
Sərvqamətlər duran yerdən gərək axsın bulağ.

Gər Müniri, kuçeyi-meyxanədən qılsan güzar,
Bir əyağ üstə əyağ al, keç o yerdən tərdimağ.

* * *

Mürği-baği-heyrətəm, bu natəvan cismim qəfəs.
Sənsiz, ey İsanəfəs, bu can gərəkməz bir nəfəs.

Bəsdi vəhşilərlə tutdun üns, ruzi-səxt oldu yar.
Məhmili-Leyli gəlir, Məcnun, sədalənmiş cərəs.

Heyrəti-ruyin olan dil Turi kuyində müdam
Musiyi-Sinanı Həq tək iqtibas eylər qəbəs.

Əzmi-gülzar etmiş ol xurşidru çün, sübh açıl,
Dəstü pa vur çün səba gülzar üçün, ey dil, tələs.

Şəm' tək hər əncüməndə rövşən etmə razını,
Eşq odunda yanmağa pərvanə tək qılsan həvəs.

Səbr qıl dərya təhində çün sədəf, dürpərvər ol,
Bəhr olub doldurma şurişlə kənarın xarü xəs.

Elm rəsmi mazivü müstəqbəl oldu qeylü qal,
Zahida, hal istəsən, al eşqdən bir qədr dərs.

Dad edib hər kuhdə açma o şirinləb sözün,
Bisütundan görməyib Fərhad cüz səs dadrəs.

Ey Müniri, ləli-canbəxşində yarın xalımı,
Ya əsəl üzrə qonubmu şəhd kəsb eylər məgəs?

* * *

Rəşk öldürür imdi məni, naz özgəyə az et,
Mən çəkməliyəm nazını, ancaq mənə naz et.

Sən bəzmi-vəfa xosrovisən, söhbəti şirin,
Şəkkər ləbin aç, min dili-Məhmudi Əyaz et.

Bir guşədə qəmzən kimi eylə məni pünhan,
Mərdüm kimi çeşmində məni məhrəmi-raz et.

Mehri-tərəfeyn bir-birə mizan ilə xoşdur,
Adilsən əgər mehrini aşiqlə təraz et.

Gini-dürd ilə, peymanəyə övsafda saf ol,
Gəz bəzmi-məhəbbətdə, könül, tərki-məcaz et.

Mehrabdır əbrulərinin taqi-hilalı,
Öp xaki-dərin, dərdini de, razü niyaz et.

Bir bəndeyi-sərgəşteyi-zülfündü Müniri,
Ey padşəhim, xatirini bəndənəvaz et.

* * *

Meydə görcək əksi-ruyin heyrət anə oldu dəst.
Söylədi ol büt görən xurşid olub atəşpərəst?

Ta nə qədr məstlik çeşmində yaxmış fitnələr,
Vay o gündən fitnələr bidar ola huşyarü məst.

Çəkmə aşiqdən inayət damənin, lütf eylə kim,
Zərrə hərgiz afitabın qədrini etməz şikəst.

İstədim ta bir nəzər ahu gözündən kam alım,
Etdi ta pir didəm içrə tiği-müjganın nişəst.

Xaktəb’ ol, istəsən ol sərvqədlər sayəsin,
Olma, ey dil, sayə tək pabəsti-hər balavü pəst.

Yox, Müniri, badeyi-gülgunə hərgiz rəğbətim,
Lə’li-yar etmiş məni sərməsti-səhbayi-ələst.

* * *

Hər könül kim, qəmi-hicr ilə, dila, şad olumu?[14]
Sərvqamətlərə münqad ola, azad olumu?

Hər şəkərləb olu Şirin kimi şirin hərəkat,
Dağü daş çapmaq ilə hər kişi Fərhad olumu?

Zülmlərlə olan abad, olur olsun bərbad,
Atəşin ahilə bərbad olan abad olumu?

Maili-xalü xətin, zülfü rüxün, zikri-ləbin,
Bəsteyi-sübhəvü əfsaneyi-zöhhad olumu?

Əsərən nisbəti var qaşına Mirrixin əgər,

[14] olurmu

Rəhmsiz mərdümi-çeşmin kimi cəllad olumu?

Ey deyən səbr elə hicranə, vüsal isə qərəz,
De görüm könlümə bu səbrdən imdad olumu?

Görsə xalü xətini sərfi-zər eylər bu zər,
Eşq nərdində Müniri kimi nərrad olumu?

* * *

Bir ruhlu insan idim, indi nəfəsim yox,
Fəryad edirəm, dadə yetən dadrəsim yox.

Bu ərseyi-şahmatdə matəm mütəhəyyir,
Yerdən ayağım üzməyə lağər fərəsim yox.

Bir sahibi-cudü kərəm idi bu vücudim,
Dəryadil idim, imdi kənarimdə xəsim yox.

Bir Yusif idim dəhrdə afaqın əzizi,
Zindani-bəla içrə bu gün həmnəfəsim yox.

Ney tək fələki tutmuş idi sövti-xəyalım,
Başdan-başa dərd olmuşam, heç yerdə səsim yox.

Salmış məni bir növ kəşakəşlərə gərdun,
Axır nəfəsimdir, yenə bir mültəməsim yox.

Göz yaşı dərunim odunu söndürə bilməz,
Halımdan olan bircə xəbərdar kəsim yox.

Bir qafiləsalariyəm aləmdə, Müniri,
Səhrayi-əsarətdə bu gün bir cərəsim yox.

* * *

Tardə şərh edərəm hali-dilim qil kimi,
Bəlkə bu əhli-dil adım çəkə təmsil kimi.

Vəqti-İsadə, könül, getməyə ruhülqüds ol,
Çağır İsayə müvəhhidləri İncil kimi.

Xidməti-Əhmədi dərk et, al əminlik ləqəbin,
Ta müqərrəb olasan Əhmədə Cibril kimi.

Kə’bəni yıxmaq üçün Əbrəhəvəş sə’y etmə,
Hünərin var isə sərf eylə Əbabil kimi.

Ali qıl təb`imi, gəzdirmə gədalıq yükünü,
Səltənət təxtini çəkdirsələ, çək qıl kimi.

Badə tək faş eləmə xəlqə könüllər sirrin,
Sirnuş olgilən hər süfrədə məndil kimi.

Dilini kəssələ[15] dil kəsmə, qələm tək de sözün,
Rövşən et dərdini hər büq`ədə qəndil kimi.

Olmasan kəhlbəsər, olmalısan dəhrdə xak,
Gərdi-rah ol, gözə gir sürmə kimi, mil kimi.

Çəkdiyim hicr günü dudeyi-ahimdən əgər,
Düşə bir zərrəsi dəryayə, boyar lil kimi.

---

[15] kəssələr

Buriya tək düşən ərbabi-xirəd xidmətin et,
Sorma cühhal ilə əl verməgi zənbil kimi.

Ey Müniri, nə yetər faidəsiz məbhəsdən,
Ki, olur mədrəsədə qal kimi, qil kimi.

* * *

Könül quşu edib ol şuxi-canşikar şikar,
Düzüb can almağa müjganların qətar-qətar.

Tökübdür arizə geysuyi-pürxəmin çin-çin,
Necə tuta bu dili-zari-biqərar qərar.

Desəm ki, hüsndə təksən, yox anə söz, ey gül,
Vəli, mənim kimi əfğan edən həzar-həzar.

Həna degil ki, yaxub ol səmənüzar əlinə,
Mən aşiqin qanıdır, eyləyib nigar nigar.

Dilim tutuldu, görüb yarı, bilmədim baxdım
Mən ona həsrət ilə, o mənə xumar-xumar.

Rüxü ləbü xəttü xal, eşqü zövqü şövqü həvəs
Edüblə çar tərəf hicrə bu düçar düçar.

Müniri, vəslə yetincə təhəmmül et hicrə,
Bu növ'həm eləməz çərxi-kəcmədar mədar.

* * *

Hər dəm üzarə zülfünü ol simbər tökər,
San gülşən içrə ahuyi-Çin mişki-tər tökər.

Bazari-eşqdə görən olsaydı tər ləbin,
Can nəqdi sərf edər, nə ki, bir simü zər tökər.

Lalə görüb cəmalın olur daği-dil qəra,
Qönçə görə dəhanıvı xuni-cigər tökər.

Eşqin həvası özgə həvadır, düşən bilir,
Ənqa əgər pər açsa, yəqin balü pər tökər.

Gülşəndə jalədir tökülüb bərgi-jalədən,
Ya kim, həyadan arizi-canandı, tər tökər.

Zikri-ləbinlə sirri-dəhanın açılsa gər,
Gahi şəkər tökər, gəhi dürrü gühər tökər.

Hicrində bir Müniri deyil sübhü şam zar,
Hər kəs yana fəraq oduna, əşki-tər tökər.

* * *

Pərvanə dedi şəm'ə, ey canıma cananə,
Mən aşiqinəm, yannam, aşiq də gərək yanə.

Pəs sən kimə aşiqsən, mə'şuqəni rövşən qıl,
Sun başını, ver onun miqrazına mərdanə.

Baş çəkdi, zəban açdı, bin ağladı, bin güldü,
Tökdü gözünün yaşın aşiq kimi damanə.

Bir söz dedi hal ilə, pərvanəni yandırdı,
Qurban elədi canın ol bir sözə pərvanə.

Yə'ni demirəm yannam, sən həm demədin yandın,
Biganədir dil canə, candır dilə biganə.

# MÜXTƏLİF ŞEİRLƏR

## TƏRCÜMEYİ-HALİ-AĞADADAŞ MÜNİRİ

Ey soran şərhi-halımı, qulaq as.
Eylə tariximə təvəccöhi-tam.
İnqilab oğlun etmişəm tarix[16],
Doğulan vaxtım olmuş ol əyyam.
Əslimiz olmuş əhli-Hövsandan,
Gəmi zəhmətkeşi olubdur atam.
Alub illik məaş üç onluq,
Güzəran etmişik onunla müdam.
Qərqi-bəhri-Xəzər olub atamız,
İxtisarən, məni oxutdu anam.
Yeddiillik yetim on beşə tək
Eylədim sevdiyim ülumu tamam.
Anam oldu məhəlləyə dərzi,
Özüm oldum cocuqlara rəssam.
Neçə illər bu gunə keçdi günüm,
Olmuş idim əciri-külli-ənam.
Rəftə-rəftə xəyalımın mürği
Qafı, ənqa tək uçdu, etdi məqam.
Neçə ovqat yekkəvü tənha
Zikrim olmuşdu bir qələmlə müdam.
Hər nə cəm’ etdi başə yarü rəfiq,
Munisim oldu sağər ilə müdam.
Rüfəqa oldu cümlə əhli-yəqin,
Tapmadı yol xəyalıma övham.
Etdi mir’ati-dildə cilvə həvəs,

[16] 1280/1863

Eylədim şe’r nəşrinə iqdam.
Görmədim nəzmdən səvayi həyat,
Zövqlən etdim ol həyata qiyam.
Qələmim seyd edib qəzali-qəzəl,
Qurmamış bir fəzadə bir sənə dam.
Munis oldu mənə əruzü heca,
Yazdığım nəzm olarla tapdı nizam.
Bu işıqlıq göründü ta məndə,
Xətm olundu Müniri ilə kəlam.

## ƏNAR QƏSİDƏSİ

Saqiya, dur bir ayağə, ələ al minani,
Cami-Cəmşidi gətir, ver o meyi-həmrani.
Açılıb kakili-sünbül, dağılıb sudeyi-eşq,
Eyləyib badi-səba ətrfəşan reyhani.
Şəkkərəfşan ol, əya tutiyi-nitqi-hünərim.
Eylə tə’rif xoş ünvan ilə bu dəstani.
Raviyi-xoşsüxən eylibdü rəvayət bu sözü,
Böylə məşhur idi, ey can, bu sözün qurbani.
Həzrəti-Xeyrünisa bir gün olmuşdi məriz,
Çox zəif olmuş idi cismü təni-nalani.
Gahi bihuş düşüb, gahi gəlirdi huşə,
Zə’fdən tapmış idi mahi-ruxi nöqsani.
Qalmamışdı bədənində rəməqi, qüvvəti-hal,
Haldən-halə salırdı təb oni hər ani.
Nagəhan gəldi Əli ibni-Əbutalib evə,
Evi öz nuri ilə eylədi çox nurani.
Gəldi xatuni-qiyamət yanına ol mövla,
Dindirib xoş dililə Fatimeyi-Zəhrani.
Dedi, ey banuyi-insiyyeyi-hura, necəsən

Və nə istər ürəyin, qıl mənə zahir ani.
Gəldi təqrirə o dəm hər iki dünya xanımi,
Dürfəşan dürrin açıb eylədi dürrəfşani.
Dedi, cəddim buyurubdur ki, bu dünyadə, qızım,
Nə qədər təng tutarlarsa sənə dünyani,
Etmə zahir ürəyində necə dərdin olsa,
Ey qızım, saxla əmoğlundan oni pünhani.
Qılma hər şey ona təklif ki, şərməndə ola,
Yana xiclət oduna, arta onun cəryani.
Gəldi təqrirə inayətlə yenə sərvəri-din,
Qıldı izhari-məhəbbət o mürüvvət kani.
Dedi, ey Fatimə, istə ki, nə istər ürəgin,
Hazıram etməgə hazır, o Hüseynin cani.
Söylədi, könlüm, əmoğli, ola gər, istər ənar,
Gərçi bu fəsldə yox olmağının imkani.
Könlümün istədigi oldu, müyəssər gər ola,
Bəzlü ehsan elə, ey dini-mubin ərkani.
Ləngəri-ərşi-bərin qövsi-zəmin, qövsi-zəman,
Məzhəri-kənzi-xəfa, həm sifəti-Sübhani.
Baisi-kövnü məkan, sərvəri-din, nuri-cəhan,
Maliki-mülki-əhəd, mərhəməti-rəhmani.
Duruban dişrə çıxıb gəzdi o gün şəhri təmam,
Tapmadı, tapdı kədər qəlbi-şəhi-mərdani.
Cüstücu çox qılıb axir belə verdilə soraq
Ki, filan kuçədə var bircə yəhud ə’yani.
Olsa, onda olar, ey sərvəri-iqlimi-səfa,
Qeyri-ondan kəsə yox olmağının imkani.
Gəlibən dögdi yəhudi qapısın şiri-Xuda,
Çıxdı biçarə yəhudi, görüb ol mövlani,
Dedi, aya, nə xəbərdür belə bir vəqt, oğul,
Gəlibən yadə salıbsan məni-nafərmani?
Buyurub şahi-üməm, varsa əgər səndə ənar,

Mənə ver birsin onun, vəchini al əl’ani.
İzz ilə ərzi-hüzur etdi o biçarə yəhud,
Vardi, əmma qutarıb, leyk durun bir ani,
Soruşum evdə əyalimdən əgər ki, tapıla,
Tapıla, eyləyərəm ol qədəmün qurbani.
İzn alıb getdi evə, aldı gətirdi bir ənar,
Dedi, var-yox, budu, əfv et məni-sərgərdani.
Aldı şövq ilə yəhudidən ənari, qayıdıb,
İstədi gəlsin evə kövnü məkan sultani.
Yolu bir kuçeyi-viyranə tərəfdən düşdi,
Durdu, bir səs gəlir ehzan ilə çox suzani.
Dedi, aya, bu səsin sahibinin dərdi nədir
Ki, tutub suzi-dili aləmi-mafihani.
Söylədi, ol kərəmü bəzlü səxa dəryasi,
Nədi dərdin, de mənə, qoyma qala pünhani.
Ərz qıldı ki, şəha, naxoşü rəncurəm mən,
Yandırır qəlbimi çox naireyi-ətşani.
İstəyir könlüm ənar, ey məhi-iqlimi-vəfa,
Olsa bu fəsldə gər olmağının imkani.
Gətirib sərvəri-kövneynü imami-səğəleyn
O ənari iki təqsim elədi asani.
Verdi bir qismini ol naxoşa çox rəğbətilən,
Dedi, al ye, elə həmdü Əhədi-yektani.
Ta alıb etdi tənavül o ənari naxoş,
Ol şəhin mərhəmətindən təzələndi cani.
Söylədi, bir o qədər həm ola, şahim, gər ənar,
Qurtarır könlüm evindən bu mərəz bünyani.
Dustan, naxoşa bəzl etdi ənarın hamısın,
Əliboş dişrə çıxıb tapdı ... heyrani.
Xah-naxah gəlib həzrəti-Zəhra yanına,
Daxil olcaq evə gördü qoyulub bir xani.
Dedi, ey Fatimə, bu xonçeyi-nurani nədir?

Dedi, sən göndərən ol xonçadur, aç, gör ani.
Bir qədər səndən, əmoğli, irəli bircə qulam,
Götürüb verdi, dedi, vermiş Əli bu xani.
Götürüb şiri-Xuda üstən onun məndilini,
Gördü sərtasər o xan nardü, çox nurani.
Şiələr, könlümü basdı yenə yüz qüssəvü qəm,
Saldı od könlümə ol Kərbübəla ətşani.
O nə həngamə idi Mariyədə aşura,
Çıxmış idi göyə ətfali-Hüseyn əfqani.
İzn alıb su götürə Kərbübəla səqqası,
Gəldi meydanə qəzəbnak o şücaət kani.
İstədi su götürə, kəsdi yolun qövmi-ədu,
Həmlə qıldı qoşuna gərm elədi meydani.
Yetirib nəhri-Fəratə özüni sür’ətilə,
İstədi su apara xeyməyə, gör üdvani,
Tutdular dövrün o qürsi-qəmərin hələ kimi,
Saldılar iki qolun, qoymadılar mövlani.
Xeyməyə su apara, saldılar atdan o şəhi,
Çağırıb yar özünə sərvəri-məzlumani.
Gəldi şahi-şühəda aldı diz üstə başını,
Ağladı, ağladı şahi-şühəda tulani.
Dedi, qardaş, aparım gəl səni mən xeymələrə,
Gözləyir yol bacın, əfqanı tutub hər yani.
Söylədi, yoxdi üzüm xeyməyə getmək, qardaş,
Dedi, bu canım alıb Səkinənin əfqani.
Çünki su vədəsi vermişdim ona, leyk qəza,
Yetirib mətləbi-məqsudinə ol üdvani.
Bəsdi bu qissəni tul etmə, Müniri ki, təmam
Yandırıbsan qəm oduna mələki-ə’lani.

# MƏSNƏVİ

Qələmi-təb`imə açdım mizi-təhrirdə fəm,
Yüz təşəkkür elədikdə dedim, ey növki-qələm.
Sən qələm eyləmisən qüvveyi-idraki-ələm,
Sən qələm eyləmisən şəkli-hürufatı rəqəm.
Sən qələmsən bu gün əsbabi-ülumun açarı,
Seyr edirsən görürəm külli-bilikdən yuxarı.
Sən gətirdin bu gözəl elmi bu gün təhrirə,
Saldın əfkarını min şivə ilə təsvirə.
Doldurub yeksərə afaqı sənin asarın,
Tutub afaqı günəş şəşəəli kirdarın.
İşləyirsən gecə-gündüz üdəba ilə müdam,
Özünə eyləmisən yatmağı bilmərrə həram.
Etmisən bir xət ilə seyr noh əflakı təmam,
Vermisən şeş cəhətin əmrinə hər yerdə nizam.
Eyləyib abi-bəqa tirə midadında zühur,
Verir əmvatə həyati-əbədi, didəyə nur.
Atmısan daireyi-noh fələkə tiri-şəhab,
Almısan əncümi-əflakdən icmali hesab.
Çəkmisən hər birini bir kürə timsalində,
Vermisən onları bir dairə öz halində.
Göstərir nəqşələrin hər kürəni bir aləm,
Var mədarı dolanır, tərbiyət eylər adəm.
Vermisən nəzmi-nizamidə təmamən xəbərin,
Göstəribsən hamının seyri-səyahət siyərin.
Vardı səkkiz yüz il əqdəm bu gözəl asarın,
İmdi Avropada təsdiq olunur kirdarın.
Qələm olsun o əli ki, tuta bilməz o qələm,
Yetirir hər hərəkatı qələm əhlinə ələm.
Gəldi cövlanə qələm, açdı zəbani-təqrir,
Kəlmeyi-ülfəti təklif edib etdi təhrir.

Dedi çar hərf ilə adəm ki, olubdur mə'ruf,
Bu gün afaqə kifayət eləyir çar hüruf.
Bu hürufat ilədir behcətü rahət, ülfət,
Bu hürufat edəcək aləmi rəşki-cənnət.
Ey Müniri, eləyə birlik əgər növziyyət,
Aləti-cəng dolanıb ancaq olar bir ülfət.

## Mirzə Əbdülxalıq Yusifin divan bağlaması münasibətilə təbriknamə

Müjdə, ey dil ki, yetib fəsli-gül, əyyami-vüsal,
İstəyir şahidi-məqsud eləsin ərzi-cəmal.

Sübh tək aç dəri-xidmət, gəlir ol arizi-mehr,
Yetir afaqə onun gəlməsini zərrəmisal.

Gülşənə susiyə jalə, açа rüxsarını gül,
Rəqs edə badi-səba, sərv eləyə istiqbal.

Susənü sünbülü gül gülşənə versin ziynət,
Bülbül əfğanə gəlib şur ilə açsın pərü bal.

Çeşmələr çeşmin açıb, nəhrlər olsun cari,
Ta ki, sirab ola bu fəsldə hər tazə nihal.

Xar tək tutma gülün damənini sübhü məsa,
Bübülün qəlbinə ta yetməyə bir zərrə məlal.

Səbzə içrə nə qədər naz ilə yatmış nərgis,
Qoymasın pərri-məgəs dəysin ona badi-şimal.

Zibi-arayiş edə tazə çiçəklərlə çəmən,
Verə sərvü səmənə cuyi-rəvan abi-zülal.

Şükr ki, kəbk durur kuhlər üstündə müdam,
Biməhalə edə şahbazlərə ğəncü dəlal.

Dolanıb çərxi-kühən, gəldi bir əyymi-cədid,
Tazə bir dairədə gərdiş edər mah ilə sal.

Süxənaralıq edərdim dili-zarımla hənuz,
Nagəhan gəldi bir aşiqküşü bir xoşxətü xal.

Ta yetib tişeyi-eşqin çala ol şirinləb,
Vermədi kuhkəni-könlümə bir ləhzə məcal.

Hərəkatı, rəvişi ahuyi-mişkini-Xütən,
Necə ahuyi-Xütən, gözləri səyyadi-ğəzal.

Həlqeyi-zülfi-siyahı şəbi-yeldayə mühit,
Mahi-ruyi verü[17] mahiyyəti-əqmarə zəval.

Xəti-zülmati ara lə'li-ləbi abi-həyat,
Xalının xadimi İskəndərü Dara, Danyal.

Müşk ilə daneyi-xalı deyəsən töv'əm olub,
Ya səvadında Bilali-həbəşidir ona xal.

Çeşmi-məftuni qəzəb vaxtı əmiri-Xarəzm,
Zülfi-aşüftəsi aşiq ürəyiyçün ağal.

---

[17] verir

Tiği-əbrusi, xədəngi-müjəsi, məst gözü
Siyəhi-zülfilə qarətgəri-mülki-çipal.

Rüxün, əbrusun o geysusi tutubdur deyəsən,
Cəm' olub ruz ilə şəb gizlənib əbr içrə hilal.

Gizlənib guşeyi-çeşmində bir aləm fitnə,
Hərəkatı, özü başdan-ayağa ğəncü dəlal.

Hüsnü, əxlaqı təmam aləmara əhsəni-xülq,
Nikbu, niksüxən, nikrəviş, nikxisal.

Qəddi Tuba, üzü cənnət, ləbi Kövsər, özü hur,
Şərmdən bir əli ruyində, bir əldə rumal.

Qönçəsin açdı dəyib bir-birə gülbərg ləbi,
Püstəsi oldu şəkərxəndə, töküb şəhdi-məqal.

Dedilər əncümənarayi-xəyalati-bədi',
Süxənamuzi-lisani-həmeyi-əlkənü lal.

Ey neyi-kilki-şəkərbəxş, dili tutiyi-can,
Şe'r tədrisinə bir qit'əsi dərsi-ikmal.

Sən ki, sərrafi-düri-bəhri-hünərsən, nə əcəb,
Etmisən bir belə gövhər görü[18] səndən ehmal.

Dedim, ey dürrü gühər gənci, nə dürrü nə gühər?
Dedi, divani-ədibül-üdəba kündsual.

---

[18] Görür

Mahi-rəxşəndeyi-Qafqaz, əzizi-Yə'qub,
Yusifi-Misri-fəsahət, məliki-mülki-kəmal.

"Yovmül-əkməltü-ləküm dinəküm"in[19] misdaqi,
Tapdı "Divan"i-kəmalatı bu gün həddi-kəmal.

Rişteyi-can ilə şirazə çəkibdir ona şeyx,
İşlədib xacə cədavili-səhadında fəal.

Zərü şəngərfi xüsusi hünər ilə Mani,
Taci-dibaçəsini etdi müzəhhib əşkal.

Ta eşitdim bu fərəhxiz kəlamı ondan,
Gəldi pərvazə könül mürgü belə etdi sual:

Bu həman Yusifdür Misrdə olmuşdu əziz?
Ta Züleyxa görüb eşqində çü ney eylədi nal.

Daməni-ismətini parə qılıb töhmət əli,
Həbsə çəkdirdi Züleyxa onu bicürmü sual.

Dedi, ol sərvqədü simbədən kim, yox, yox,
Mavəra qüvvə veribdir ona həyyü mütəal.

O səriül-qələmi təb'i edib Misrə əziz,
Hüsni-göftarı Züleyxanı edib məsti-cəmal.

Şövqi-Həq ləzzəti çəkdirdi onu zindanə,
Nə ki, oldu səbəbi-töhməti-ismət səri-bal.

---

[19] "Maidə" surəsinin 3-cü ayəsinə işarədir:"Bu gün dininizi sizin üçün kamil etdim..."

Bu həman xaliqi-əfkari-bədaye’dir kim,
Lütfi-şe’rində təhəyyürdə qalıb külli-məqal.

Eşq odu buteyi-dildə zəri-təb’in bişirib,
Gəzdirib dəstfişar etmək üçün qali-beqal.

Surəti-nəzmə çəkib mülki-sərii ilə hal,
Kim  o halında təsəvvür olunur əhsəni-hal.

Tudələnmiş gühəri-nəzmin o bəhri-hünərin
Külli-peymaneyi-əhli-xirəd etmiş məkyal.

Sünbüli-məzrəeyi-hikməti xirmən-xirmən,
Daneyi-danişi dadül-ürəfa vəqti-nəval.

Şiri-simürği-xəyalatinə bir sərhəd yox,
Kim tapıb tairi-əfkarı məqamati-məhal.

Hikməti, fəlsəfəni, məbhəsi-coğrafiyanı
Öz kəlamında edib Əsməqi tək istemal.

Əhnəfi-helmi səfaməsləkü loğman kəlimat,
Gənci-sədri gühəri-hikmət ilən malamal.

Suzəni mərtəbə, Ceyhundilü Seyhunhərəkat,
Vaqifi-həndəsəvü Nasiri-Xosrov iqbal.

Əzhəri, Yafeyiyi-çardəhom əsrdir ol,
Nəzminə nəzmi-nigahını çəkiblər timsal.

Görə tədrisi-hümayunə səni gər İdris,
Gəlü[20] təhsili-kəmal etməyə bu istidlal.

[20] Gəlir

Odur ustad, odur səltənəti-nəzmə əmir,
Odur iqlimi-fəsahətdə tapan istiqlal.

Xaliqi-şe'r, rəsuli-şüəra, məbdəi-zövq,
Xazini-dürri-şərəf, məxzəni-əsrari-cəmal.

Çünki, zatülqudusun məqdəmi-pakindən öpüb,
Lütf edibdir bu məqamı ona Xəllaqi-cəlal.

Kəlmeyi-zati-cəlal aldı qərarım əldən,
Dedim: -Ey qəlbi Xəlilü dili Cəbrilməqal.

Deyil ol rəsmə səza, bəzl eləmək bərrə, demiş
Bir də zikr eylə o məbud adını, canımı al.

Gər yazıb bu neçə əbyatı Müniri təbrik,
Əfvi-nöqsanını ümmid edib etmiş irsal.

Yusifa, ərzimi dildarə yetirmək səndən,
İcziruluq eləmək məndən olar hər minval.

Ta yanım hicrdə Nəmrudi-zaman atəşinə,
Bəlkə mən ölmüşə mümkün ola gülzari-vüsal.

İstərəm qadiri-mehmanın olan günləri kim,
Yetişəm məzhərə, ta kəşf ola keyfiyyəti-hal.

Gər Məsiha çağıram, qövmi-yəhud eylər hücum,
Gər çəkəm Həqq adını, tiğ çəkər min dəccal.

Mümkün olmaz qəmü dərdim eləyim ərzi-xütur,
Çün tutub həmçü fələk dövrəmi qövmi-cühhal.

# RÜBAİLƏR

Ta var bu diyari-həmdiyar, ey saqi,
Ver mey mənə, vermə ixtiyar, ey saqi.
Bu nəhv ki, saqeyi-fələk seyr eylər,
Bu dardə qoymayır mədar, ey saqi.

* * *

Ta var bu şəhri-kəcmədar, ey saqi,
Olmam qəmü qüssədən kənar, ey saqi.
Sərxoş yaşayım, bilməyim aləmdə nə var,
Bu dairədən olum kənar, ey saqi.

* * *

Ta var qəmi-zülfi-müşkbar, ey saqi,
Könlümdə gəzir çü şahmar, ey saqi.
Məstkən məni-divanəni ətfali-bələd,
Ta etməyə görsə səngsar, ey saqi.

* * *

Tarix edib ömrümü təmam, öldürdü,
Rövşən günümü eylədi tar, öldürdü.
Xosrovligimiz getdi Şəkər bəhsilə,
Bir dəf’əlik etdi təlxkam, öldürdü.

* * *

Bir ev ki, tapar çar ilə təb’ arayiş,
Ol evdə həmişəliklə olmaz saziş.
Xahişlə bu əhli-xanə təkmil olmaz,
Bihudə o xanədən olur bu xahiş.

* * *

Təhsili-ülumdur, könül, bizlərə fərz,
Bildirmək o zövqi-elmi yekdigərə fərz.
Biz növ`i-bəşər sərahətən bimarıq,
Bilməm bu mərəz əlacın etmək kimə fərz.

* * *

Baxdım bu cahan mülkinə əz ruyi-şüur,
Bir vaqiə gördüm ki, beqeyr əz şərü şur.
Heç vəch ilə olmadım bir işdən müxbir,
Gəldim bu cəhanə kur, getdim yenə kur.

* * *

İstər birisi həyatı rahətlə keçə,
Sərf etməsin ömrü nə halətlə keçə.
Əvvəldə bilə daxiləvü xaricəsin,
Öz sərfəsini diqqəti-nam ilə keçə.

* * *

Hər sudə ki, laləzari-səhra yanıdır,
Hər laləsi bir laləüzarın qanıdır.
Hər bərgi-bənövşeyi ki, yerdən göyərir,
Bir xali-siyəhdir, al yanağı tanıdır.

## Xəyyamdan tərcümələr

Çün keçmişdir ömr, nə şirin, nə təlx,
Peymanə dolan zaman, nə Bağdad, nə Bəlx.
Mey iç, mənü səndən sora çox ay gələcək,
Çox səlx dönüb ğürrə olar, ğürrə də səlx.

* * *

Kəc eyləsə gərdiş əhli-aləmlə fələk,
İsbati-lüzum eyləməz aləmdə məhək.
Göstərməsə tə`m əgər təbiətdə özün,
Hardan olur isbati-cəhan, qədri-nəmək.

## BAHAR AĞLAYIŞI

Yetdi fərvərdin, könül, səhralər oldu laləzar,
Lalələrlə damənin doldurdu kuhü kuhsar.
Açılıb hər yan çiçəklər aldı əldən ixtiyar,
Qönçə bağrı qan olub, bülbüllər oldu biqərar.
Gəlməyəydi kaş fərvərdin nə bu il, nə bahar.

Gəldi nilgün libasilə bənövşə gülşənə,
Verdi qəməfza xəbərlər bağə, sərvə, susənə.
Qüssədən çak etməyə gül atdı əl pirahənə,
Açmadı göz nərgiz əsla, bağə, dağə bu sənə.
Naləyə gəldi butalar, atəşindil əşkbar.

Saf ikən küllən bulanlıq axdı çayü nəhrlər,
Nuh əsri tək cəhanə saldı tufan bəhrlər.
Genə çü qarətlər ilə qarət oldu şəhrlər,
Görməmişdi bir belə xunriz mərdüm qəhrlər,
Etmiş olsunlar bu növ'i xanimanlar tarmar.

Oldu bir qovğayi-üzma, qondu bir tufani-səxt,
Qalmadı Qafqasya bağında səlamət bir dirəxt.
Oldu viran xanələr, bədbəxt olub çox nikbəxt,
Qüssələndi şad ürəklər, qanə döndü ləxt-ləxt.
Ağladı ətfali-məhzun, nalə qıldı zar-zar.

Bir yəhuda bais oldu min Məsiha qanına,
Oldu qəltan nagəhan minlərcə Yəhya qanına.
Tifllər qanı qarışdı pirü bürna qanına,
Oldu müfsidlər səbəb kim, əhli-dünya qanına,
Çəkdi min növrəs cəvan ağuşə xaki-rəhgüzar.

Yetməmiş axırzəman, dəccallər etdi zühur,
Dustü düşmən zahir oldu, düşmən oldu narü nur.
Əql heyran qaldı bu həngaməyə, cəhl etdi zur,
Oldular bir cami-cəhlü cəbrdən məsti-qürur,
Oldu kinü büğzlər beynəlmiləldə aşikar.

Milləti-islamə atəş açdı qarətgər miləl,
Etdilər bildiklərin müslimlərə çatdıqca əl.
Qıldılar bəs fe'li-naşayəstəyə onlar əməl,
Etməyə tiyhu şikarın şahbaz oldu əcəl.
Etdilər amaci-tir ətfalı bihəd, bişümar.

Xırdaca mə'sum uşaqlar tö'meyi-şəmşir olub,
Düxtərü duşizələr həm müstəhəqqi-şir olub.
Möhtərəm, nazlı hərəmlər layiqi-təhqir olub,
Zülmi-əda, bir deyil Bakıdə, aləmgir olub,
Bəski etmiş kəc rəviş aləmdə çərxi-kəcmədar.

Çox şərəfli rütbələr əhrarımız oldu şəhid,
Etdilər bir zülm, Əli övladına etmib Yəzid,
Xeymeyi-namusa od vurdu, əl atdı hər pəlid,
Bir tərəfdən qalmadı imdad üçün cayi-ümid,
Ta ki, əlsizlər-ayaqsızlar ola ümmidvar.

Bir tərəfdən üç gecə-gündüz açıb ağzın tüfəng,
Tuplər düşmən tərəfdən səslənib gərm oldu cəng.
Etdi seyr ayropalanlar şəhr üstə bidirəng,
Qanə qərq oldu igidlər, itdi yeksər namü nəng,
Qalmadı islam üçün bir cayi-izzü iftixar.

Oldu Qafqasya sərasər dəhr ara dəryayi-qan,
Oldu ol dəryayi-qanə qərq minlərcə cəvan.
Külli-müslim qarə geydi, kuhü səhra ərğəvan,
Ey Müniri, bombəvü topü tüfəng, ayropalan
Odlu bir tarixdir, yaz ani, qalsın yadigar.

"Mart qırğını" kitabı, 1919.

## MƏRSİYEYİ-YUSİF

Tərki-Misri-tən qılıb, Yusif kimin bir cani-pak,
Ey günəş, çıx baş açıq, ey sübh sinən eylə çak.

Bərqi-ahimdən od al, yax afitabın, ey fələk,
Tök yerə əncümləri, qıl əşkim ilə iştirak.

Lalə tək bas bağrına daği-fəraqın içmisən,
Yasəmən tək yasə batdın, dildən ahi-dərdnak.

Bilmədikdə qədrini əshab, ya əhbabü qeyr,
Açdı ağuşun ləhəd, bağrına basdı tirə xak.

Buyi-tabutun alıb səndəl yanar hər bəzmdə,
Bərd kəfənin  görcək oldu şərhə-şərhə, çak-çak.

Zəmzəmasa əşk töksün, Kə'bə tək geysin qəra,
Şəm' tək giryan olub, pərvanə tək yansın, nə bak.

Misali-Müniri tazədən Yəqubə bir beytül-həzən,
Söylə, ya Yəqub, "əbkət, hazihi yövmül-əzak"[21].

Nəxli-tarixi-vəfatın verdi bari-səmmi-qəm,
"Külli nisbi-halik illa vəch fi səmmil-həlak"[22].

---

[21] "Ağlayımmı bu matəm günündə".
[22] "Hər bir canlı məhv olacaq, Ondan başqa".

# MƏRHUM MİKAYIL SEYDİ HAQQINDA FƏRYAD

Ey sipehri-kəcröv, ey gürgi-əcəl, ey əhrimən,
Hansı işrətxanəni kim, etmədin beytülhəzən?
Hansı bir sərvi-səhidir, etmədin pamal onu?
Hansı bir şümşaddır kim, yıxmadın torpağə sən?
Hansı bir nazlı bədəndir, etmədin təslimi-xak?
Hansı pirahəndir, ani etmədin axır kəfən?
Hansı kəştidir, ədəm dəryasına qərq etmədin?
Hansı bir kəsdir, o kəştidə gedənlərdən gələn?
Hansı bir nəxcirdir, seyd etmədin səyyad tək?
Hansı bir səyyaddır, seydilə vermib bad tək?
Ah, ey çərxi-sitəmgər, dad əlindən, ah, ah,
Ah, ah, ey süfləpərvər, dad əlindən, ah, ah!

Mehrü mahın kaş olaydı sərnigun, ey çərxi-dun,
Mən kimi sən də geyəydin bir libasi-nilgun.
Kaş qəlbim tək yanaydı ruzü şəb əncümlərin,
Kaş olaydı noh rəvaqın cami-eyşim tək nigun.
Kaş olaydın parə-parə, ey könül ayinəsi,
Surəti-halı mənə göstərməyəydin vajgun.
Tök sirişkim tək yerə əncümlərin, ey noh fələk,
Ta bu qəm dəryası üzrə mövclənsin əşki-xun.
Bir təzəlzüllə xərab, ey kaş, olaydı taqi-çərx,
Kaş olaydı bir xərabə noh sipehri-bisütun.
Ah, ey çərxi-sitəmgər, dad əlindən, ah, ah,
Ah, ah, ey süfləpərvər, dad əlindən, ah, ah!

Sübh ta bu vaqeyi-cangahi gördi hövlnak,
Qönçə tək təng oldu bağrı, dərdə gəldi sinəçak.
Baş açıq, xurşid üfüqdən çıxdı düşdü toprağa,
Yandırıb gərduni ta çəkdi bir ahi-suznak.
Gözlərindən tökdü nərgis əşki-gülgun arizə,
Geydi nili camə nilufər, geyim mən həm nə bak.
Qoydu xaki-tirəyə baş bir şəhiri-ruzigar,
Ağla, ey ağlar gözüm, bir gün olursan sən də xak.
Ey rəfiqi-basəadət, qıldın əzmi-kuyi-yar,
Pişvaz eylər səni lütfilə ol məhbubi-pak.
Ah, ey çərxi-sitəmgər, dad əlindən, ah, ah,
Ah, ah, ey süfləpərvər, dad əlindən, ah, ah!

Soldu gül, gül fəsli guya kim, yetib vəqti-xəzan,
Qoydu lalə bağrını məhzun olub daği-nişan.
Oldu işrət vəqti səhni-gülsitan matəmkədə,
Gül giribançak olub, bülbül olub həm növhəxan.
Dərdə gəldi qönçə bağrı tökdü gülgun əşk üzə,
Yasə batdı yasəmən, həm susən açdı min zəban.
Sərvboylar tərki-bağ etdilər, oldu bağda,
Gül xəzan, sünbül pərişan, qanə döndü ərğəvan.
Ey Müniri, fəsli-möhnətdir, zəmani-dərdü qəm,
Gün tutuldu, oldu ay məhzun, mükəddər asiman.
Ah, ey çərxi-sitəmgər, dad əlindən, ah, ah,
Ah, ah, ey süfləpərvər, dad əlindən, ah, ah!

*Oktyabr, 1916*

# MİRZƏ SƏMƏNDƏR DƏRBƏNDLİ HAQQINDA NÖVHƏ

Ah, səd ah, ey Səməndər, ey ədibi-möhtərəm,
Külli-əhbabın qədin bari-fəraqın etdi xəm.

Bu cahan bir camdır, saqi fələk, səhba əcəl,
Bu əcəl səhbasın içmiş hər gədavü möhtərəm.

Bir ədibi-xoşbəyan xəlq etmiş idi Həq səni,
Bilməzəm təhriri-övsafın necə qılsın qələm.

Şairi-bozorq idin, tarixbin, sahibtəmiz,
Rişteyi-tənzimdə dürri-kəlamın müntəzəm.

Var idin aləmdə, vardı dildə bir aləm sürur,
İxtiyari-rehlət etdin, oldu sur əyyamı qəm.

Pir idin, pürfikr, ərbabi-qələmlər munisi,
Oldu hər sahibqələmdən ötrü hicranın ələm.

Səndin əbrarın məsayib məclisinin zakiri,
Səndin əşrarın qılan, zülmün yazan bifərtü kəm.

Gərçi sən tək Cürmiyü Salik, Müsəvvir, Xürrəmi,
Vaqifü Seydi, Sürəyya, salikani-zülhiməm.

Etməmiş isbati-asar ol girami zatlər,
Qoydular dari-bəqayə mülki-fanidən qədəm.

Getməmişkən onların dağı dili- əhbabdən,
Qoydu hicranın bu gün dağ üstə daği-tazə həm.

Büləlalər, Bülfərəc, Vaqidilər həm var idi,
Qalmadı onlardan aləmdə əsər illa rəqəm.

Gər qürub etmiş vücudun dəhni-qürbi-xakdə,
Leyk edər mahiyyətin xurşidi-əfkarın ələm.

Gəldi tarixi-vəfatın çünki ba qılmanü hur, (1335)[23],
Həq, görüm, hurikəniz etsin səni qılman qədəm.

Yox, Müniri, ariyət dərdinə çarə kim, bu dəhr
Aləmi-surətdə gər tiryakdir, mənada səmm.

[23] 1916-1917

# MƏNZUM MƏKTUBLAR

## ƏBDÜLHƏMİD MİNAYA MƏKTUB

Getmiş idim neçə günlərdi ki sənsiz çəmənə,
Çəmən olmuşdu cəhənnəm mənə, gül xar mənə.

Gül görəndə, düşər indi rüxi-əlvan yadə,
Baxa bilmirdi gözüm sərvə, gülə, yasəmənə.

Dur idim gərçi vüsalından, əya, xosrovi-naz,
Bağlamazdım yenə dil bir büti-şirinsüxənə.

Gah üzün Yusifi min cilvə qılardı dildə,
Gahi Yə'qub kimi çulğaşar idim mihənə.

Əlimə heç nə yetişməzdi, olurdum mə'yus,
Dəhənin sirrini faş eylə, edim hər gələnə.

Yetdi bir namə mənə həmçü qəmisi-Yusif,
Ta ki, basdım qədəmim səhneyi-beytülhəzənə.

Naməni ta ki ziyarət elədim, çün Yə'qub
Günbəgün, rövşən olub dideyi-nadidə sənə.

Neçə əbyat ki, təhrir eləmişdin, yeksər,
Oxuyanda onu şəkkər gəlir indi dəhənə.

Yazmışam beytinə bir beyt oxuyub söyləginən:
Əhsən olsun mənə, təhsin ola v angah[24] sənə.

---

[24] v angah

Ey Müniri, demə hər şe'rini əğyarə, vəli,
Ərz qıl hali-dilin mən kimi hicran çəkənə.

* * *

Verir e'cazi-şe'rin mürdə cismə tazə can, Yusif,
Olub məzmuni-əbyatın Məsihayi-zəman, Yusif.

Açıb gənci-xəyalatın, çəkib dürrü gühər nəzmə,
Kəmali-müfti-gəncinəsin qıldın əyan, Yusif.

Nəqudat ilə sahibsikkə idin bəhri-təbinlə,
Görüb kamiləyar, irsal qıldın ərməğan, Yusif.

Peyapey xaliqi-təb'in edər tənzili-vəhyi-şe'r,
"LəciduriyhəYusif"[25] ayəsin eylər bəyan, Yusif.

Vəli, "külli-cədidun ləzzə"[26] mə'nasın cədid eylər,
Gətir təhrirə zövq ilə, ola qüvvət rəvan, Yusif.

Burax qəvvasi-təb'in futə vursun bəhri-əş'arə,
Gətirsin tazə-tazə dürrlər, versin nişan, Yusif.

Vüsali-söhbəti-zövqi-kəlam olduqda naməqdur,
Bəyani-tazə lütf et, ta olaq bir həmzəban, Yusif.

Mənəm dürri-qəzəl bazarının xibrə xiridarı,
Cəvahir - sözlərindir, təb'i-şe'rin bəhrü kan, Yusif.

Cəvabi-ərni "Lən"dir gərçi əmma vardır ümmidim,
Eşitsin bu Müniri "ləntərani" bir zəman, Yusif.

---

[25] Yusif" surəsi, ayə 94."...Yusifin ətrini alıram".
[26] Bütün yeniliklər ləzzətli olur.

## YUSİFİN MÜNİRİYƏ YAZDIĞI KAĞIZI

Ey könül behcəti, hicründə könül qan oldu,
Yandı qəmdən bu sitəm xanəsi viran oldu.

Şad olan könlümü, ey şux, qəmalud etdin,
Gördü düşmən məni bu hal ilə giryan oldu.

Çəkdiyim ahü fəğan etmədi tə'sir sənə,
Hər görən hali-dili-zarımı heyran oldu.

Bilirəm öldürəcəkdir məni bu möhnəti-hicr,
Olmadı çarə, dəxi dərd firavan oldu.

Olu bir gün ki, gəlirsən, "Hanı miskin Yusif",
Yusifin canı deyərlər sənə qurban oldu.

Getdi biçarə cahandan, gözə xaki-dərini
Tutiya eyləməmiş xak ilə yeksan oldu.

## MÜNİRİNİN VERDİYİ CAVAB

Ta könül Misrinə şəh Yusifi-Kənan oldu,
Piri-Kən'an eşidib xürrəmü xəndan oldu.

Yetdi namıə necə Yə'qubə qəmisi-Yusif,
Fövri beytülhəzənim xaneyi-şadan oldu.

Aşiqanə o kəlami ki, yazıbdın mənə sən,
Oxuyub bu dili-atəşzədə nalan oldu.

# NURİYƏ KAĞIZ

Ey şikənci-qəmə daruyi-məsərrət, Nuri.
Məzhəri-gövhəri-məknuni-sədaqət, Nuri.

Qəməri-bürci-məlahət səməri-nəxli-vəfa,
Bəhri-vicdan, düri-gəncineyi-ülfət, Nuri.

Qürəba qəlbinə əş’ari-fəsihi munis,
Ürəfa qövminə əczayi-həlavət, Nuri.

Çəkdi qürbət məni zənciri-fəraqə sənsiz,
Saldı cinsi qəmə aşubü şiddət, Nuri.

Bilmədim qədrini vəslin, çəkərəm hicranı,
Qalmayıb məndə qəmü möhnətə taqət, Nuri.

Dolanırmı fələkin çərxəsi, aya bir də
Edərikmi yenə min şövqlə söhbət, Nuri.

Gözlərəm qürbət ara, lütf eləsin əş’arın,
Zövqi-şe’rin verə bu könlümə behcət, Nuri.

Sahibi-lütfü kərəm gözləməyir şanü şərəf,
Edər üftadələri bəlkə riayət, Nuri.

Qələmi-şövqüli al, ta oxuyub bu rəqəmi
Qoyma etsin dəxi tə’sir bu qürbət, Nuri.

Ülfətin, Nuri, Müniridən, amandır, kəsmə,
Şahsən bəndəyə, bu bəndə - rəiyyət, Nuri.

# SEYYİD ZƏRGƏRƏ BİR KAĞIZ

Ey sipehri-fərəhə nuri-müəzzəm Seyyid,
Feyzbəxşi-həmeyi-ənqəşi-aləm Seyyid.

Şüəra məclisinin zinəti sürət qələmi,
Ürəfa məclisinə niri-mükərrəm, Seyyid.

Ta vüsalından ələm eylədi gərduni-kühən,
Olmayıb hiç fərəh dildə fərahəm, Seyyid.

Görmədim cənnəti mən kuyi-vüsalundan uzaq,
İstəməm cənnəti hicründə çü Adəm, Seyyid.

Səbzi-meydan eləməz könlüməüzü xürrəmü səbz,
Bəzmi-Cəmşid açıla, saqi ola Cəm, Seyyid.

Güli çox, bülbüli çox, leyk bir əhli-dili yox,
Ta edə söhbəti bu könlümü xürrəm, Seyyid.

O keçən günlərin əfsus ki, şükranəsini
Etmədik, imdi əcəb bağlı qalıb qəm, Seyyid.

Yoxdu bir şux ki, sorsun nədir aşiq halın,
Ya ki, dəf’i-qəm üçün eyləyə çəm-xəm, Seyyid.

Bir dua et məni-hicrankeşə, istə Həqdən,
Bəlkə bir də görüşək zövqlə bahəm, Seyyid.

Qiyməti-vəslini bildirdi mənə hicranın,
Can imiş qiyməti, nə məxzənü dirhəm, Seyyid.

Mərdümi-didə Münirilə kəlamın gözlər,
Ta ki, rövşən ola bu dideyi-pürnəm, Seyyid.

# Mündəricat

**MİRZƏ AĞADADAŞ MÜNİRİ**

# BAHAR AĞLAYIŞI

Naşir: Ceyhun Əliyev
Dizayner: Flora Əliyeva
Texniki redaktorlar: Ülvi Arif, Asim Səfərov
Korrektor: Ülviyyə Bahir

---

Yığılmağa verilmişdir: 01.04.2016
Çapa imzalanmışdır: 05.04.2016
Tiraj: 200, ş.ç.v. 5
Sifariş № 24
“Ecoprint” nəşriyyatının mətbəəsində
çap olunmuşdur
Bakı, Mətbuat pr., 529
Tel.: (99455) 216 09 91